QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

May 2014 05 (1059)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun təsis edilməsi haqqında
## *Azərbaycan Respublikası Prezidentinin Fərmanı*



Elmi-texniki nailiyyətlərin insan həyatına sürətlə daxil olduğu, qloballaşma meyillərinin geniş vüsət aldığı müasir dövrdə Azərbaycan cəmiyyətində müxtəlif elm sahələri üzrə biliklərin artırılması və rəqabətədayanıqlı insan kapitalının formalaşdırılması mühüm əhəmiyyət kəsb edir. Davamlı sosial-iqtisadi inkişafın təmin edilməsi, hüquqi dövlət və vətəndaş cəmiyyəti quruculuğunun sürətləndirilməsi fasiləsiz təhsil konsepsiyasını gerçəkləşdirmək və mütərəqqi maarifçilik ənənələrini davam etdirmək sahəsində yeni səmərəli mexanizmlərin yaradılmasını şərtləndirir.

Müasir informasiya cəmiyyətinin və biliklərə əsaslanan iqtisadiyyatın tələblərini nəzərə alaraq elmi-texniki, sosial-iqtisadi, humanitar biliklərin artırılması, azərbaycançılıq məfkurəsi zəminində milli-mənəvi, dini dəyərlərin təbliği, ekoloji təfəkkürün formalaşdırılması, Azərbaycan dövlətinin daxili və xarici siyasətinin, ölkədə aparılan sosial-iqtisadi, mədəni quruculuq proseslərinin mahiyyətinin ictimaiyyətə çatdırılması məqsədi ilə Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

1. Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondu yaradılsın.

2. "Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun Nizamnaməsi" təsdiq edilsin.

3. Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun işçilərinin say həddi 20 ştat vahidi müəyyən edilsin.

4. Azərbaycan Respublikasının Nazirlər kabineti:

4.1. Azərbaycan Respublikası Prezidentinin aktlarının bu fərmana uyğunlaşdırılmasına dair təkliflərini üç ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

4.2. Azərbaycan Respublikası Nazirlər Kabinetinin normativ hüquqi aktlarının bu fərmana uyğunlaşdırılmasını üç ay müddətində təmin edib Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

4.3. mərkəzi icra hakimiyyəti orqanlarının normativ hüquqi aktlarının bu fərmana uyğunlaşdırılmasını nəzarətdə saxlasın və bunun icrası barədə üç ay müddətində Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

4.4. Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun xərclər smetasını, ştat cədvəlini və işçilərinin aylıq vəzifə maaşlarını bir ay müddətində təsdiq edib Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

4.5. Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun fəaliyyətinin təşkili ilə bağlı zəruri maliyyə və maddi-texniki təminat məsələlərini həll etsin;

4.6. bu fərmandan irəli gələn digər məsələləri həll etsin.

5. Azərbaycan Respublikasının Ədliyyə Nazirliyi Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun dövlət qeydiyyatına alınmasını bir ay müddətində təmin etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 7 may 2014-cü il*

# "Heydər Əliyev ideyaları işığında inkişaf edən və yüksələn Azərbaycan"

## *ADPU-da ümummilli lider Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr olunmuş respublika elmi konfransı keçirilib*

May ayının 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr olunmuş "Heydər Əliyev ideyaları işığında inkişaf edən və yüksələn Azərbaycan" mövzusunda respublika elmi konfransı keçirilmişdir. Konfransda Səbail Rayon İcra Hakimiyyətinin başçısı Asif Əsgərov, Yeni Azərbaycan Partiyasının (YAP) Siyasi Şurasının üzvü, Milli Məclisin deputatı Aydın Mirzəzadə,YAP-ın İdarə Heyətinin üzvü, partiyanın Səbail rayon təşkilatının sədri, professor Zahid Qaralov, şair-dramaturq, Prezident təqaüdçüsü Ramiq Muxtar iştirak etmişlər.

Konfrans iştirakçıları əvvəlcə ulu öndər Heydər Əliyevin universitetdəki abidəsi önünə gül dəstələri düzmüş, xatirəsini ehtiramla yad etmişlər. Sonra konfrans ADPU-nun Böyük Akt zalında davam etdirilmişdir. İlk olaraq ulu öndər Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükutla yad edilmişdir.

Professor-müəllim heyətinin və tələbələrin iştirak etdiyi konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədov ulu öndər Heydər Əliyevin Azərbaycan xalqı qarşısındakı misilsiz tarixi xidmətlərindən danışmışdır. Rektor Y.Məmmədov bildirmişdir ki, may ayının 10-da Azərbaycan xalqının dahi oğlu, qüdrətli siyasi xadim, müstəqil dövlətimizin memarı və qurucusu, ümummilli lider Heydər Əliyevin anadan olmasının 91-ci ildönümü tamam olur. Bu əlamətdar gün münasibətilə respublikamızda və dünyanın bir çox ölkələrində müxtəlif tədbirlər keçirilir. Təhsil Naziri Mikayıl Cabbarov bu il fevral ayının 26-da «Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin anadan olmasının 91-ci ildönümü münasibətilə təhsil müəssisələrində keçiriləcək tədbirlər haqqında» 229 saylı əmr imzalamışdır. Bu əmrə uyğun olaraq ADPU-da mart ayının 12-də ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 91-ci ildönümü münasibətilə keçiriləcək tədbirlər haqqında müvafiq əmr imzalanmışdır. Bugünədək ADPU-da ulu öndər Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr edilmiş müxtəlif tədbirlər, o cümlədən ali məktəb tələbələrinin bədii yaradıcılıq festivalı, tələbə və magistrantların inşa yazı müsabiqəsi, idman yarışları və digər tədbirlər keçirilib. May ayının 7-də universitetimizin professor-müəllim heyəti və tələbə kollektivi Fəxri xiyabanda dahi öndər Heydər Əliyevin məzarını ziyarət edəcək, məzarı önünə əklili qoyacaq, sonra isə universitetdə ulu öndər Heydər Əliyevə həsr olunmuş yaradıcılıq sərgisinə və Heydər Əliyev muzeyinə baxış olacaq, daha sonra isə Böyük akt zalında ümumuniversitet toplantısı keçiriləcəkdir. Həmin gün universitetdə ilk dərslər ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətinə həsr ediləcəkdir. Bizim bu gün keçirdiyimiz bu respublika elmi konfransı da ulu öndər Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr edilmiş silsilə tədbirlərdən biridir.





Rektor Y.Məmmədov çıxışına davam edərək bildirmişdir ki, böyük qürur hissi və fəxrlə deyə bilərik ki, Ulu Öndər XX əsrin ən parlaq və nadir şəxsiyyətlərindən biridir. Dahi şəxsiyyət Heydər Əliyev iti və parlaq zəkası, yüksək intellekti, zəngin erudisiyası, siyasi uzaqgörənliyi və müstəsna təşkilatçılıq qabiliyyəti ilə xalqımızın böyük hörmət və nüfuzunu qazanmışdır. Bildirmişdir ki, dahi öndər Heydər Əliyevin uzaqgörən siyasətinin nəticəsi olaraq ötən əsrin 70-80-ci illərində Azərbaycanda 213 yeni iri sənaye müəssisəsi istifadəyə verildi.

Rektor Y.Məmmədov həmçinin Ulu Öndərin Azərbaycana həm sovet hakimiyyəti, həm də müstəqillik dövründə rəhbərlik etdiyi vaxtlarda təhsil sahəsində həyata keçirdiyi islahatlardan, elm və təhsilin inkişafına göstərdiyi böyük diqqət və qayğıdan söz açmışdır. Xalqımızın müdrik oğlu Heydər Əliyevin respublikamıza rəhbərlik etdiyi 1969-1982-ci illər həm də Azərbaycan təhsilinin intibah dövrü kimi səciyyələndirilir. Belə ki, həmin dövrdə məktəbəqədər tərbiyə müəssisələrinin sayı 1600-dən 1875-ə çatmışdı. Təkcə 1969-1982-ci illərdə Azərbaycanın şəhər, kənd və qəsəbələrində 700-ə qədər yeni məktəb binası tikilib istifadəyə verilmişdi.

Ümummilli lider Heydər Əliyevin şəxsi təşəbbüsü və təşkilatçılığı ilə Azərbaycanda 1970-1982-ci illərdə 5 yeni ali təhsil müəssisəsi yaradılmış, ali məktəb tələbələrin sayı isə 70 mindən 100 min nəfərə çatdırılmışdı.

Qeyd etdiklərimlə yanaşı, ulu öndər Heydər Əliyev istedadlı azərbaycanlı gənclərin keçmiş SSRİ-nin qabaqcıl və nüfuzlu ali təhsil müəssisələrində təhsil almalarına da xüsusi diqqət yetirirdi. Ötən əsrin 80-ci illərinin əvvəllərində hər il 1000-1400 nəfər azərbaycanlı gənc respublikamızdan kənarda ali təhsil almağa göndərilirdi. Halbuki, 1969-cu il üçün həmin rəqəm cəmisi 47 idi. Məhz Ulu Öndərin şəxsi təşəbbüsü ilə 1970-1980-ci illərdə keçmiş SSRİ-nin 50-dən artıq böyük şəhərinin 170-dən çox nüfuzlu ali məktəblərində respublikamızın xalq təsərrüfatı, elm, təhsil və mədəniyyətinin 80-dən artıq sahəsini əhatə edən və zəruri ehtiyac duyulan 250-dən çox ixtisas üzrə 15 mindən artıq azərbaycanlı gənc ali təhsil almışdır. Azərbaycanlı gənclərin xaricdə təhsili sahəsindəki bu uzaqgörən siyasəti müasir dövrümüzdə Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev uğurla davam etdirir. Belə ki, «2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı» çərçivəsində 5 min nəfər azərbaycanlı gəncin xaricdə ölkəmiz üçün vacib olan ixtisaslar üzrə təhsil alması nəzərdə tutulur. Bu da şübhəsiz ki, ölkəmizdə insan kapitalının formalaşmasına öz dəyərli töhfələrini verəcəkdir.

Ulu öndər Heydər Əliyev həmin uzaqgörən siyasəti azərbaycanlı hərbi mütəxəssislərin yetişdirilməsi sahəsində də həyata keçirirdi. Təkcə 1982-ci ildə keçmiş Sovetlər Birliyinin ali hərbi məktəblərinə 550 nəfər azərbaycanlı gənc qəbul edilmişdi. Cəmşid Naxçıvanski adına Hərbi Liseyin yaradılması da ulu öndər Heydər Əliyevin adı və vətənpərvər fəaliyyəti ilə bağlıdır.

Müdrik siyasi xadim Heydər Əliyev deyirdi: «Güclü iqtisadiyyat güclü dövlət, güclü ordu deməkdir». Bu baxımdan, ulu öndər Heydər Əliyev müstəqil Azərbaycanın iqtisadi cəhətdən qüdrətli bir dövlətə çevrilməsi üçün səmərəli fəaliyyət proqramı gerçəkləşdirdi. Ümummilli Liderin böyük qətiyyət və uzaqgörənliklə müəyyənləşdirdiyi yeni neft strategiyasına uyğun olaraq 1994-cü il sentyabrın 20-də Bakıda dünyanın aparıcı neft şirkətləri ilə «Əsrin müqaviləsi»nin imzalanması suveren Azərbaycana böyük iqtisadi və siyasi dividendlər gətirdi. "Əsrin müqaviləsi"nin bu böyük əhəmiyyətini nəzərdə tutan ulu öndər Heydər Əliyev demişdir: "Biz bu müqaviləni imzalamaqla Azərbaycan Respublikasının suveren hüquqlarının bərqərar olduğunu, xalqımızın öz sərvətlərinə özünün sahib olduğunu bir daha nümayiş etdirdik. Biz bu müqaviləni imzalamaqla Azərbaycan Respublikası ilə dünyanın inkişaf

(Davamı 2-ci səhifədə)

# “Heydər Əliyev ideyaları işığında inkişaf edən və yüksələn Azərbaycan”

(Əvvəli 1-ci səhifədə)

etmiş dövlətləri, onların ən böyük şirkətləri arasında əlaqə yaradır, Azərbaycan iqtisadiyyatının dünya iqtisadiyyatına, azad bazar iqtisadiyyatına qovuşması üçün əsas yaradırıq. Biz bu müqaviləni imzalamaqla dünyaya bir daha nümayiş etdiririk ki, müstəqil Azərbaycan Respublikası demokratik və hüquqi dövlətdir”.

Böyük şəxsiyyət Heydər Əliyev sözün həqiqi mənasında milli təəssübkeşimiz idi. Hər bir zaman ən yüksək və ən mötəbər kürsülərdə «Hər bir insanın milli mənsubiyyəti onun qürur mənbəyidir. Mən həmişə fəxr etmişəm, bu gün də fəxr edirəm ki, mən azərbaycanlıyam!» deyən Heydər Əliyev ən böyük Azərbaycanlı idi. Dünya Azərbaycanlılarının I Qurultayında ulu öndər Heydər Əliyev Azərbaycançılığı belə səciyyələndirmişdir: «Azərbaycançılıq öz milli mənsubiyyətini qoruyub-saxlamaq, milli-mənəvi dəyərlərini qoruyub-saxlamaq, eyni zamanda onların ümumbəşəri dəyərlərlə sintezindən, inteqrasiyasından bəhrələnmək və hər insanın inkişafının təmin olunması deməkdir».

Xalqımızın dilinə, zəngin mədəni irsinə, yüksək milli-mənəvi dəyərlərinə böyük qayğı və diqqət göstərilməsi də ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətinin əsas istiqamətlərindən biri olmuşdur. Hələ 1978-ci ildə Ulu Öndərin qətiyyət və fədakarlığı sayəsində Azərbaycan dili dövlət dili kimi Konstitusiyaya salınmışdı. Ulu öndər Heydər Əliyev Azərbaycan dilinə olan böyük məhəbbətini, sonsuz ehtiramını müstəqil ölkəmizə rəhbərlik etdiyi dövrlərdə daha yüksək səviyyədə göstərmişdir. Ulu Öndər 18 iyun 2001-ci il tarixdə «Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında» fərman, 4 iyul 2001-ci il tarixdə «Azərbaycan Respublikası Dövlət Dil Komissiyasının tərkibinin təsdiq edilməsi haqqında» sərəncam, 9 avqust 2001-ci il tarixdə «Azərbaycan əlifbası və Azərbaycan dili günü təsis edilməsi haqqında» sərəncam, 2 yanvar 2003-cü il tarixdə isə «Azərbaycan Respublikasında Dövlət dili haqqında» Azərbaycan Respublikası Qanununun tətbiq edilməsi barədə» fərman imzalamışdır.

Ulu öndər Heydər Əliyev yenidən respublikamızda rəhbərliyə qayıtdıqdan sonra həmişə olduğu kimi, yenə elmə, təhsilə böyük qayğı və diqqət göstərmişdir. Ümumiyyətlə, müdrik rəhbərimiz Heydər Əliyevin 30 ildən artıq davam edən ictimai-siyasi fəaliyyətində elmə, təhsilə qayğı və diqqət daim mühüm yer tutmuşdur. Ulu Öndər yenidən ölkə rəhbərliyinə qayıtdıqdan sonra ilk görüşlərindən birini 1993-cü il sentyabrın 21-də Azərbaycan Milli Elmlər Akademiyasında (AMEA) keçirmişdi. 1997-ci il yanvarın 31-də ulu öndər Heydər Əliyev AMEA-nın rəhbərliyini və bir qrup aparıcı alimi qəbul etmiş, onlarla elm sahəsində islahatların aparılmasının vacibliyi barədə ətraflı söhbət etmişdir. Bütün bunlar isə təbii ki, ümummilli lider Heydər Əliyevin alimlərimizə bəslədiyi böyük hörmətin, hədsiz qayğı və diqqətin nümunəsi kimi izah edilir.

Qüdrətli siyasi xadim Heydər Əliyev respublikamızda yenidən hakimiyyətə qayıtdıqdan sonra təhsil müəssisələrinin normal fəaliyyət göstərməsi və təhsilin milli tərəqqimizin əsas amilinə çevrilməsi üçün ölkəmizdə geniş islahatlar proqramı işlənib hazırlandı. «Təhsil millətin gələcəyidir!» deyən ulu öndər Heydər Əliyev 1998-ci ilin martında «Azərbaycan Respublikasında təhsil sahəsində islahatlar üzrə Dövlət Komissiyası yaradılması haqqında» sərəncam imzaladı. Hərtərəfli müzakirələrdən sonra 1999-cu ilin iyununda «Azərbaycan Respublikasında təhsil sahəsində İslahat Proqramı» təkmilləşdirilmiş variantda təsdiq edildi.

Səbail Rayon İcra Hakimiyyətinin başçısı Asif Əsgərov, YAP-ın İdarə Heyətinin üzvü, partiyanın Səbail rayon təşkilatının sədri, professor Zahid Qaralov, YAP-ın Siyasi Şurasının üzvü, Milli Məclisin deputatı Aydın Mirzəzadə, şair-dramaturq, Prezident təqaüdçüsü Ramiq Muxtar dövlətimizin formalaşması, inkişafı və dünyada tanınması istiqamətində Ümummilli Liderin böyük xidmətlərindən danışmışlar.

Qeyd edilmişdir ki, bu gün müstəqil Azərbaycanın qazandığı bütün uğurlarının əsası məhz ulu öndər Heydər Əliyev tərəfindən qoyulmuşdur. Dahi şəxsiyyət Heydər Əliyevin bütün fəaliyyəti yalnız xalqın xidmətinə yönəlmişdir. Ulu Öndərin dərin düşüncəsi, mütərəqqi ideyaları, qurub-yaratdıqları, siyasət, iqtisadiyyat, elm, təhsil və digər sahələrdə həyata keçirdiyi islahatlar, möhtəşəm layihələr xalqımızın rifahına, işıqlı gələcəyinə xidmət edir. Hər bir azərbaycanlı ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətini dərindən öyrənməli, onu gələcək nəsillərə çatdırmalıdır.

Konfransda həmçinin ulu öndər Heydər Əliyevə həsr olunmuş film nümayiş etdirilmişdir.

Onu da qeyd edək ki, konfransa təqdim edilən məruzələr “Pedaqoji Universitet Xəbərləri” jurnalının ümummilli lider Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr olunmuş xüsusi buraxılışında çap ediləcəkdir.

**Mənsur İBRAHİMLİ,**
**Mətbuat və informasiya şöbəsinin müdiri,**
**Azərbaycan Jurnalislər Birliyinin üzvü**

# Ulu öndər Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr olunmuş ümumuniversitet toplantısı

Azərbaycan xalqının böyük oğlu, parlaq zəka sahibi, qüdrətli tarixi şəxsiyyət, ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 91-ci ildönümü münasibətilə respublikamızda və dünyanın bir çox xarici ölkələrində müxtəlif tədbirlər həyata keçirilir. Bu tədbirlərdə xalqımızın müdrik oğlu Heydər Əliyevin ölkəmiz və dövlətimiz qarşısında göstərdiyi böyük tarixi xidmətlər konkret faktlar əsasında sadalanır, həmçinin Ulu Öndərin uzaqgörən siyasi kursunun Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən müasir dövrün tələblərinə uyğun olaraq çox uğurla davam etdirildiyi fikri xüsusi vurğulanır. Bu il lər, o cümlədən ali məktəb tələbələrinin bədii yaradıcılıq festivalı, tələbə və magistrantların inşa yazı müsabiqəsi, idman yarışları və digər tədbirlər keçirilmişdir. Böyük qürur və fəxr hissi ilə deyə bilərik ki, ümummilli liderimiz Heydər Əliyev XX əsrin ən parlaq və nadir şəxsiyyətlərindən biridir. Ulu öndər Heydər Əliyev iti və parlaq zəkası, yüksək intellekt səviyyəsi, zəngin erudisiyası, siyasi uzaqgörənliyi və müstəsna təşkilatçılıq qabiliyyəti ilə xalqımızın böyük hörmət və nüfuzunu qazanmışdır. Ümummilli liderimiz Heydər Əliyevin fəaliyyəti eyni zamanda daim xarici dövlət rəhbərlərinin,dünyanın məşhur siyasi xadimlərinin diqsəlişi dövrü başlamışdır. İqtisadiyyatda, kənd təsərrüfatında, elm və təhsildə, mədəniyyət sahəsində böyük bir canlanma, dirçəliş və inkişaf var idi. Məhz ulu öndər Heydər Əliyevin uzaqgörən və müdrik siyasəti nəticəsində Azərbaycan öz inkişaf göstəricilərinə görə tez bir zamanda keçmiş Sovetlər Birliyinə daxil olan respublikalar arasında öncül yerə çıxmışdı.

Dahi öndər Heydər Əliyevin uzaqgörən siyasətinin nəticəsi olaraq ötən əsrin 70-80-ci illərində Azərbaycanda 213 yeni iri sənaye müəssisəsi istifadəyə verildi.

Xalqımızın müdrik oğlu Heydər Əliyevin respublikamıza rəhbərlik etdiyi 1969-1982-ci illər həm də Azərbaycan təhsilinin intibah dövrü kimi səciyyələndirilir. Belə ki, həmin dövrdə məktəbəqədər tərbiyə müəssisələrinin sayı 1600-dən 1875-ə çatmışdı. Təkcə 1969-1982-ci illərdə Azərbaycanın şəhər, kənd və qəsəbələrində 700-ə qədər yeni məktəb binası tikilib istifadəyə verilmişdi.

Ümummilli lider Heydər Əliyevin şəxsi təşəbbüsü və təşkilatçılığı ilə Azərbaycanda 1970-1982-ci illərdə 5 yeni ali təhsil müəssisəsi yaradılmış, ali məktəb tələbələrin sayı isə 70 mindən 100 min nəfərə çatdırılmışdı.

Qeyd etdiklərimlə yanaşı, ulu öndər Heydər Əliyev istedadlı azərbaycanlı gənclərin keçmiş SSRİ-nin qabaqcıl və nüfuzlu ali təhsil müəssisələrində təhsil almalarına da xüsusi diqqət yetirirdi. Ötən əsrin 80-ci illərinin əvvəllərində hər il 1000-1400 nəfər azərbaycanlı gənc respublikamızdan kənarda ali təhsil almağa göndərilirdi. Halbuki, 1969-cu il üçün həmin rəqəm cəmisi 47 idi. Məhz Ulu Öndərin şəxsi təşəbbüsü ilə 1970-1980-ci illərdə keçmiş SSRİ-nin 50-dən artıq böyük şəhərinin 170-dən çox nüfuzlu ali

dövrümüzdə Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev uğurla davam etdirir. Belə ki, «2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı» çərçivəsində 5 min nəfər azərbaycanlı gəncin xaricdə ölkəmiz üçün vacib olan ixtisaslar üzrə təhsil alması nəzərdə tutulur. Bu da şübhəsiz ki, ölkəmizdə insan kapitalının formalaşmasına öz dəyərli töhfələrini verəcəkdir.

Ulu öndər Heydər Əliyev 1993-cü ilin iyun ayında ölkəmizdə yenidən hakimiyyətə qayıtdıqdan sonra isə xalqımızın milli müstəqillik arzusunun bütövlükdə həyata keçirilməsini təmin etkasında təhsil sahəsində İslahat Proqramı» təkmilləşdirilmiş variantda təsdiq edildi.

Əsası ulu öndərimiz Heydər Əliyev tərəfindən qoyulmuş neft strategiyasının uğurla həyata keçirilməsi nəticəsində respublikamızda qeyri-neft sektorunun kənd təsərrüfatının, rabitə və informasiya texnologiyalarının, turizmin və digər sahələrin inkişafında mühüm nailiyyətlər əldə edilir. Azərbaycanda davamlı və sabit alternativ iqtisadiyyatın yaradılması üçün ciddi addımlar atılır. Azərbaycanın müdafiə qüdrəti günü-gündən yüksəlir. Ölkəmizin beynəlxalq siyasi nüfuzu xeyli yüksəlmişdir. Elm və təhsilin inkişafına







may ayının 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) ulu öndər Heydər Əliyevin anadan olmasının 91-ci ildönümü münasibətilə keçirilən ümumuniversitet toplantısında da bu barədə maraqlı və məzmunlu çıxışlar edilmişdir.

ADPU-da ulu öndər Heydər Əliyevin anadan olmasının 91-ci ildönümü münasibətilə keçirilən ümumuniversitet toplantısı universitet rəhbərliyinin, professor-müəllim heyətinin və tələbə kollektivinin Fəxri xiyabanda dahi öndər Heydər Əliyevin məzarının ziyarət etməsi ilə başlanmışdır. ADPU-nun kollektivi Ulu Öndərin məzarı önünə əklil qoymuş, xatirəsinə ehtiramı bildirmişdir. Xalqımızın görkəmli oftalmoloq alimi, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilmiş, məzarı önünə gül dəstələri düzülmüşdür. Sonra universitetdə ulu öndər Heydər Əliyevə həsr olunmuş yaradıcılıq sərgisinə və Heydər Əliyev muzeyinə baxış olmuş, daha sonra isə Böyük akt zalında ümumuniversitet toplantısı keçirilmişdir.

İlk olaraq ulu öndər Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükutla yad edilmişdir. Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov bildirmişdir ki, bugünədək ADPU-da ulu öndər Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr edilmiş müxtəlif tədbirqət mərkəzində olmuşdur. Ulu öndər Heydər Əliyev bütün dünyada Azərbaycan xalqının simvolu səviyyəsinə yüksəlmişdir. Elə buna görə də, bu gün hər bir Azərbaycan vətəndaşının qəlbində dahi öndər Heydər Əliyevin işıqlı, parlaq obrazı yaşayır. Tələbə-gənclər həmişə ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətini dərindən öyrənməlidirlər. Çünki ulu öndərimiz Heydər Əliyev son 35-40 ildə ölkəmizin hərtərəfli inkişafında və dünya miqyasında tanınmasında əvəzsiz xidmətlər göstərmiş böyük tarixi şəxsiyyətdir. Biz bu gün həyatımızın hansı sahəsinə diqqət yetirsək, xalqımızın bu böyük oğlunun fədakar əməyini, çoxcəhətli fəaliyyətini görürük. Dahi şəxsiyyət Heydər Əliyev hələ Sovetlər Birliyi dövründə Azərbaycana rəhbər seçilərkən ölkəmizi tənəzzüldən xilas etmiş, onu inkişaf yoluna çıxarmışdır. 1969-cu ilin iyul ayının 14-də Heydər Əliyevin Azərbaycana rəhbər seçilməsi ilə respublikamızın ictimai-siyasi, sosial-iqtisadi və elmi-mədəni həyatının yüksəlişi ...



məktəblərində respublikamızın xalq təsərrüfatı, elm, təhsil və mədəniyyətinin 80-dən artıq sahəsini əhatə edən və zəruri ehtiyac duyulan 250-dən çox ixtisas üzrə 15 mindən artıq azərbaycanlı gənc ali təhsil almışdır. Azərbaycanlı gənclərin xaricdə təhsili sahəsindəki bu uzaqgörən siyasəti müasir

di. Öz müdrik siyasəti, zəngin idarəçilik və dövlətçilik təcrübəsi sayəsində Azərbaycanın formal, nominal müstəqilliyini faktiki, hüquqi müstəqilliyə çevirdi. Ulu Öndər müstəqil dövlətimizi qurdu, gücləndirdi, onu dünya miqyasında tanıtdı, Azərbaycanın nüfuzlu və mötəbər beynəlxalq təşkilatların tamhüquqlu üzvü etdi.

Qüdrətli siyasi xadim Heydər Əliyev respublikamızda yenidən hakimiyyətə qayıtdıqdan sonra təhsil müəssisələrinin normal fəaliyyət göstərməsi və təhsilin milli tərəqqimizin əsas amilinə çevrilməsi üçün ölkəmizdə geniş islahatlar proqramı işlənib hazırlandı. «Təhsil millətin gələcəyidir!» deyən ulu öndər Heydər Əliyev 1998-ci ilin martında «Azərbaycan Respublikasında təhsil sahəsində islahatlar üzrə Dövlət Komissiyası yaradılması haqqında» sərəncam imzaladı. Hərtərəfli müzakirələrdən sonra 1999-cu ilin iyununda «Azərbaycan Respubli-

dövlət səviyyəsində yüksək qayğı və diqqət göstərilir. Ulu öndər Heydər Əliyevin müdrik siyasi kursu, strateji dövlətçilik xətti müstəqil dövlətimizin bugünkü uğur və nailiyyətlərinin əsas təminatçısıdır.

Rektor Y.Məmmədov çıxışına davam edərək bildirdi ki, bu il may ayının 10-da həm də Heydər Əliyev Fondunun fəaliyyətə başlamasının 10 ili tamam olur. Bu Fond ulu öndər Heydər Əliyevin siyasi irsini öyrənmək və təbliğ etməklə yanaşı, həyatımızın bir çox sahələrində, o cümlədən elm, təhsil, səhiyyə və mədəniyyət sahəsində müxtəlif layihələr həyata keçirir. Həmin layihələr ölkəmizin ictimai-mədəni və sosial-iqtisadi həyatına dəyərli töhfələr verir. Ölkənin birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili Mehriban Əliyevanın çoxşaxəli fəaliyyəti xalqımız tərəfindən böyük razılıq hissi ilə qarşılanır və yüksək qiymətləndirilir. Heydər Əliyev Fondu həm Azərbaycanda, həm də ölkəmizin hüdudlarından kənarda xeyirxahlıq, mərhəmət və alicənablıq ünvanı kimi tanınır. Fondun bu yaxınlarda məktəbəqədər təhsilin keyfiyyətinin yüksəldilməsi ilə bağlı təqdim etdiyi layihə də təqdirəlayiqdir və biz bu layihənin də Azərbaycan təhsilinin inkişafına müsbət təsir göstərəcəyinə inanırıq.

(Davamı 3-cü səhifədə)

## Ulu öndər Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr olunmuş ümumuniversitet toplantısı

(Əvvəli 2-ci səhifədə)

Tədbirdə məruzə ilə çıxış edən ADPU-nun Ümumi tarix kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev, Pedaqoji fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov, 91 vətənpərvər ziyalıdan biri, Riyaziyyat və informatika fakültəsinin dekanı, dosent Maqsud Nəcəfov ulu öndər Heydər Əliyevin dünya miqyaslı siyasi xadim olduğunu, öz çoxşaxəli idarəçilik və dövlətçilik fəaliyyətində həmişə xalqımızın milli maraqlarını qoruduğunu, həyatımızın bütün sahələri kimi elm və təhsil sahəsinə də böyük qayğı və diqqət göstərdiyini xüsusi qeyd etmişlər.

Tədbirdə çıxış edən Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının müdiri, Azərbaycan Qızıl Aypara Cəmiyyətinin (AQAC) ADPU bölməsinin sədri, professor Jalə Qədimova başçılıq etdiyi bölmənin ulu öndər Heydər Əliyevin anadan olmasının 91-ci ildönümü münasibətilə həyata keçirdiyi müxtəlif tədbirlərdən danışmış, bölmənin fəaliyyətinə hərtərəfli dəstək verdiyinə görə universitetin rektoru, professor Yusif Məmmədova öz dərin təşəkkürünü bildirmişdir. Toplantıda həmçinin çıxış edən Ümumi kimya və kimyanın tədrisi metodikası kafedrasının müdiri, professor Ələkbər Qurbanov ulu öndər Heydər Əliyevi bütün Türk dünyasının dünya şöhrətli siyasət və dövlət xadimi kimi səciyyələndirmişdir. ADPU-nun dosenti, şair Oqtay Rza ulu öndər Heydər Əliyevə həsr etdiyi şeirini oxumuşdur.

Ümumuniversitet toplantısında böyük öndər Heydər Əliyevə həsr olunmuş film və tələbələrin ifasında ədəbi-bədii kompozisiya nümayiş olunmuşdur.

**Gülnar SÜLEYMANOVA,**
**Mətbuat və informasiya şöbəsinin əməkdaşı**

# "Azərbaycan gənclərinin xaricdə təhsil almalarında ulu öndər Heydər Əliyevin xidmətləri"

### *ADPU-da bu mövzuda tədbir keçirilib*

Mayın 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr olunmuş "Azərbaycan gənclərinin xaricdə təhsil almalarında ulu öndər Heydər Əliyevin xidmətləri" adlı tədbir keçirildi. Tədbiri ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev giriş sözü ilə açaraq qonaqları və tədbir iştirakçılarını salamladı. İlk olaraq ulu öndərimiz Heydər Əliyevin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edildi. Sonra Azərbaycan Respublikasının Dövlət Himni səsləndirildi.

Tədbirdə "Türkiyə Universitetləri Məzunları" İctimai Birliyinin sədri (TUMİB) Çingiz Bayramov çıxış etdi. O, vaxtilə ümummilli liderimiz Heydər Əliyevin rəhbərliyi ilə xarici ölkələrdə azərbaycanlı gənclərin təhsil alması təşəbbüsünə toxunaraq, Ulu Öndərin bu addımının bu gün öz bəhrəsini verməsini xüsusi qeyd etdi. Ç.Bayramov bidirdi ki, vaxtilə Ulu Öndərin əsasını qoyduğu bu mütərəqqi ənənə müasir dövrümüzdə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilir. 2007-2015-ci illərdə 5000 nəfər azərbaycanlı gəncin dünyanın müxtəlif xarici ölkələrində təhsil alması nəzərdə tutulur.

Azərbaycan Respublikası Prezidenti Administrasiyasının İctimai-siyasi məsələlər şöbəsinin əməkdaşı Rasim Mirzəyev çıxış edərək Ulu Öndərin təhsil sahəsində atdığı uğurlu addımlardan danışdı. Ulu Öndərimizin ölkəmizin gələcəyini düşünərək tələbələri xaricdə təhsil almağa göndərməsi təşəbbüsünün bu gün öz müsbət nəticəsini verdiyini vurğuladı.

Rusiyada təhsil almış azərbaycanlı məzun Zakir Abdullayev tələbəlik illəri ilə bağlı xatirələrini bölüşərkən Rusiyada diaspora təşkilatı formalaşması məsələsindən bəhs edərək, Azərbaycan həqiqətlərinin dünyaya çatdırılmasında Ulu Öndərimizin xidmətlərini xüsusi qeyd etdi, tələbələrə təhsillərində uğurlar arzuladı.



Litvada təhsil almış məzun Ceyhun İbrahimov isə çıxışında ölkə Prezidenti cənab İlham Əliyevin təşəbbüsü ilə hazırlanmış "2007-2015-ci illərdə Azərbaycan gənclərinin xaricdə təhsili üzrə Dövlət Proqramı"nın əhəmiyyətindən danışdı və xaricdəki diaspor təşkilatlarımızın fəaliyyətindən bəhs etdi.

Gənc Alim, Aspirant və Magistrlar Cəmiyyətinin sədri İlqar Orucov çıxış edərək, Ulu Öndərin təhsil strategiyasından danışdı. O, bildirdi ki, hələ Sovet dönəmində ulu öndər Heydər Əliyevin təşəbbüsü ilə 3645 nəfər xarici dövlətlərə təhsil almaq üçün göndərilmişdir. İ.Orucov qeyd etdi ki, Ulu Öndərin təhsilə göstərdiyi böyük qayğı və diqqət nəticəsində Azərbaycan təhsili inkişaf etmiş, dünyada tanınmış, yeni təhsil müəssisələri tikilmiş, yüksək ixtisaslı kadrlar hazırlanmışdır. İ.Orucov bu gün Ümummilli Liderimizin ideyalarının uğurla davam etdirildiyini bildirərək, təhsil sahəsindəki uğurlarımızdan danışdı. O, bildirdi ki, keçən ildən etibarən dünya alimlərinin Bakıda beynəlxalq forumu keçirilir. Belə tədbirlərin keçirilməsi nəticəsində dünya alimləri ilə Azərbaycan alimləri arasında təcrübə mübadiləsi artır.

Sonra ADPU-nun "Türk araşdırmaları" elmi-tədqiqat laboratoriyasının müdiri, professor Elman Quliyev çıxış etdi. O, ulu öndər Heydər Əliyevin dahi bir şəxsiyyət olduğunu vurğulayaraq, Ümummilli Liderimizin siyasət, iqtisadiyyat, mədəniyyət və təhsil sahəsindəki uğurlu addımlarından söz açdı. Ümummilli liderimizin uzaqgörən siyasətçi olaraq, azərbaycanlıların xaricdə təhsil almaq təşəbbüsünün əhəmiyyətindən bəhs edən professor E.Quliyev bu gün vaxtilə irəli sürülən təşəbbüslərin öz bəhrəsini verməsinə toxundu. Professor E.Quliyev xaricdə təhsil alan tələbələrin diaspora fəaliyyətindən söz açaraq, bu sahədə Ulu Öndərimizin qayğı və diqqətinin əhəmiyyətindən bəhs etdi.

Pedaqoji fakültənin dekanı, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov çıxış edərkən ümummilli lider Heydər Əliyevin hakimiyyətə gəldikdən sonra atdığı uğurlu addımlardan danışdı. Konkret statistik rəqəmlərə istinad edən professor F.Rüstəmov məhz ulu öndərimiz Heydər Əliyevin uzaqgörən siyasəti nəticəsində xaricdə təhsil alan azərbaycanlı tələbələrin sayının illər keçdikcə artdığını xüsusi olaraq qonaqların diqqətinə çatdırdı. O, qeyd etdi ki, ulu öndər Heydər Əliyevin təşəbbüsü ilə 170-dən çox şəhərdə 257 ixtisas üzrə 15000 min azərbaycanlı tələbə təhsil almışdır.

Sonda ADPU-nun prorektoru, professor R.Baxşəliyev çıxış edərək ulu öndər Heydər Əliyevin təhsil siyasətindən danışdı. O, qeyd etdi ki, SSRİ vaxtında ümummilli liderimiz Heydər Əliyev məhz ADPU-da Hərbi fakültə yaradılması təşəbbüsünü irəli sürmüşdür. Ulu öndər Heydər Əliyevin C.Naxçıvanski adına Hərbi Liseyin yaradılması sahəsindəki uğurlu fəaliyyətindən söz açan professor R.Baxşəliyev çağdaş dövrümüzdə vaxtilə atılan addımların bəhrəsindən danışdı.

**Leyla FAİQQIZI,**
**"Türk araşdırmaları" ETL-nin elmi işçisi**

# "Zəmanəmizin böyük azərbaycanlısı"

***Pedaqogika və psixologiya fakültəsində ümummilli lider Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr olunmuş tədbir belə adlanırdı***

May ayının 5-də ADPU-nun Pedaqogika və psixologiya fakültəsində ümummilli lider Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr olunmuş "Zəmanəmizin böyük azərbaycanlısı" adlı tədbir keçirilmişdir. Tədbirdə ilk olaraq Azərbaycanın Dövlət Himni səsləndirilmişdir.

Tədbiri giriş sözü ilə açan fakültənin dekanı, dosent Şəhla Əliyeva Azərbaycanın mürəkkəb dövründə hakimiyyətə gələn ulu öndər Herdər Əliyevin xilaskarlıq və quruculuq işlərindən danışmışdır.- Dosent Ş.Əliyeva bildirmişdir ki, ulu öndər Heydər Əliyev Azərbaycan xalqı üçün göylərin seçimidir və xalqımız üçün ən lazımlı anda göndərilmişdir. Ulu öndər Heydər Əliyevin uzaqgörən daxili və xarici siyasətinin nəticəsidir ki,bu gün ölkəmiz dünyaya inteqrasiya edir.Ulu Öndərin vətəndaşlıq hünəri bundan ibarətdir ki, o, insanları sabaha inamını özünə qaytarmışdır.Azərbaycan Respublikasının dövlət müstəqilliyi ulu öndər Heydər Əliyevin siyasətinin nəticəsidir. Müstəqil Azərbaycanımızın memarı və qurucusu olan Heydər Əliyev öz ömrünü Vətənimizin tərəqqisinə və çiçəklənməsinə,beynəlxalq aləmdə tanınmasına,bütün dünya azərbaycanlılarının Azərbaycançılıq ideologiyasının ətrafında sıx birləşməsinə, dövlətçiliyimizin möhkəmlənməsinə,-xalqımızın milli-mənəvi dəyərlərinin qorunub saxlanılmasına, dövlət quruculuğuna, xalqımızın mədəni yüksəlişinə həsr etmişdir. Ulu öndər Heydər Əliyev bütün




Türk dünyasının sevgisini qazanmış,ömrünü bütünlükdə doğma Vətənə həsr etmişdir.

Pedaqogika və psixologiya fakültəsinin dekan müavini, dosent Allahyar İmanov öz çıxışında vurğulamışdır ki, indi Azərbaycan müstəqil dövlətdir.Dünyanın hansı ölkəsində, hansı yerində olmasından asılı olmayaraq, hər bir azərbaycanlı hiss edir ki onun Azərbaycan adlı bir Vətəni var. Hər bir azərbaycanlı harda yaşamasından asılı olmayaraq, Azərbaycana ata ocağı kimi baxır.

Ulu öndər Heydər Əliyevin milli tərbiyə haqqında fikirlərində Vətən sevgisi, xalq, millət sevgisi, Azərbaycançılıq ideologiyası böyük yer tutur Heydər Əliyev Azərbaycanın parlaq Günəşidir.Adı müasir tariximizə qızıl hərflərlə yazılan Heydər Əliyevi ancaq yeri,göyü işığa qərq edən Günəşlə, bir də qartal məskəni uca zirvələrlə müqayisə eymək olar.Nə qədər ki, ölkəmizin bayrağı səmalarda dalğalanır, Heydər Əliyevin nəfəsi də Azərbaycanı isidəcəkdir.

Yaş və pedaqoji psixologiya kafedrasının müdiri, professor Ərəstun Baxşəliyev bildirmişdir ki, müasir Azərbaycan cəmiyyəti üçün zəruri və mühüm olan amillərdən biri insanların tərbiyəsi prosesində milli-mənəvi dəyərlərdən düzgün istifadə olunmasıdır. Ulu öndərHeydər Əliyev siyasi fəaliyyətinin mənasını yalnız Azərbaycanın tərəqqisini təmin etməkdə, Azərbaycan xalqının mədəni, mənəvi və intellektual yüksəlişinə nail olmaqda görürdü.

Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Müseyib İlyasov öz çıxışında ulu öndər Heydər Əliyevin ölkəmizin təhsil sistemindəki rolundan bəhs etmişdir. O, qeyd etmişdir ki, məhz Heydər Əliyevin uzaqgörən siyasətinin nəticəsində təhsilin humanistləşdirilməsi prinsipi həm dövlət sənədlərində, həm də pedaqoq və psixoloqların əsərlərində zəruri şərt kimi birmənalı şəkildə irəli sürülmüşdür.

Tədbirin sonunda ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətinə həsr olunmuş videoçarx nümayiş etdirilmişdir.

**İnarə Babayeva,**
**Pedaqogika və psixologiya fakültəsinin I kursunun 101-ci qrup tələbəsi, TGT-nin fakültə üzrə sədr müavini**

# “TƏHSİLİN AKTUAL PSİXOLOJİ-PEDAQOJİ PROBLEMLƏRİ” MÖVZUSUNDA ELMİ KONFRANS

*Ümumi psixologiya və Ümumi pedaqogika kafedralarının may ayının 16-da birgə keçirdikləri elmi konfrans ümummilli lider Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr olunmuşdu. Konfransı ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev açmış, universitetdə Ulu Öndərin doğum günü münasibəti ilə həyata keçirilən tədbirlərdən bəhs etmişdir. Ümumi psixologiya və Ümumi pedaqogika kafedralarının keçirdikləri konfransın da bu münasibətlə keçirilən tədbirlərdən biri olduğunu söyləmişdir.*

*Məqamı ikən xatırladaq ki, adıçəkilən kafedralar tədbirə heç də əliboş gəlməmişdilər. İki bölmədən ibarət olan (“Psixologiya bölməsi” və “Pedaqogika bölməsi”) topluya unuversitetin 80 müəlliminin imzası ilə 74 məqalə daxil edilmişdi.*

Konfransda giriş sözü söyləyən Ümumi psixologiya kafedrasının müdiri, psixologiya elmləri doktoru, professor Ramiz Əliyev üç mərhələyə bölməklə Ulu Öndərin həyat və fəaliyyəti haqqında konfrans iştirakçılarına məlumat vermişdir. 1969-cu ilə qədərki dövrü I mərhələ, 1969-



1982-ci illəri II mərhələ, 1982-ci ildən sonrakı dövrü III mərhələ qismində təqdim etmişdir.

Ulu Öndərin həyatının 1969-cu ilə qədərki dövründən bəhs edərkən natiq Heydər Əliyevin əsasən MTN-də işlədiyi illərin səciyyəvi cəhətlərindən bəhs etmişdir. Heydər Əliyevin keçmiş SSRİ zamanında MTN-də belə yüksək dərəcəyə çatan ilk azərbaycanlı olduğunu söyləməklə, özünün azərbaycanlı olması ilə həmişə qürur duyan bu insanın xalqımızın nə qədər düşünən beyinlərini, tərəqqipərvər, vətənpərvər zəkasının imperiyanın zərbələrindən qurtarması kimi faktları qürurla dilə gətirmişdir. Azərbaycanda ilk dəfə ali hakimiyyət mərtəbəsində olduğu illərdə uzaqgörən siyasət yürüdərək Heydər Əliyevin SSRİ-nin tanınıbseçilən ali hərbi məktəblərinə hər il onlarla azərbaycanlı gəncin göndərilməsi işindəki vacib fəaliyyətində, ümumittifaq sosializm yarışının keçici qırmızı bayraqlarının dəfələrlə Azərbaycana gətirilməsindən, kiçik bir respublikanın zaman-zaman dünya dövlətləri sırasında tanınması yolunda apardığı taleyüklü məsələlərdən bəhs etmişdir. Moskvada ən yüksək vəzifə postunda əyləşdiyi illərdə də doğma Azərbaycanını unutmamasından, respublikamızın müstəqilliyi dövründə respublika prezidenti olaraq göstərdiyi cahanşümul xidmətlərdən dolğun və ətraflı bəhs etmişdir.

Konfransa “Təhsilə psixoloji xidmətin aktual psixoloji problemləri” mövzusu ilə qatılan professor Ramiz Əliyev Azərbaycan təhsili üçün çox vacib olan bir məsələyə toxunmuşdur. Qeyd etmişdir ki, bu zərurəti əhalinin, xüsusilə uşaq və yeniyetmələrin psixoloji müdafiəsini gücləndirmək tələbatı həlliqaçılmaz etmişdir. Bunu (uşaq, yeniyetmə və gənclərin təhsilini, təlim-tərbiyəsini yeni keyfiyyət və məzmun əsasında qurmağı), yazır professor R.Əliyev,- Azərbaycan cəmiyyətində gedən proseslər, sosial, iqtisadi, siyasi, hüquqi, ideoloji dəyişikliklər, qarşılıqlı münasibətlər sistemindəki yeniliklər, insan amilinə, onun fəaliyyətinə, şəxsi keyfiyyətlərinə verilən tələblər zəruri etmişdir. Təhsil sistemi məhz bu zəmində cəmiyyətdə yeni təfəkkür tərzi, mənəvi-psixoloji dəyərlərə malik olan şəxsiyyətlər formalaşdırır, cəmiyyətin humanistləşdirilməsinə xidmət edir. Bütün bunlar elmi, nəzəri və praktik fəaliyyətin vəhdətdə götürülməsi şəraitində mümkündür. Bu, hazırkı şəraitdə psixoloji xidmət işinə artan tələbatın ən mühüm göstəricisidir.

Professor R.Əliyev psixoloji xidmətin təşəkkül və inkişafını şərti olaraq üç mərhələyə ayırır: məişət səviyyəsində psixoloji xidmət; ayrı-ayrı mütəfəkkirlərin psixoloji xidmət sahəsində fəaliyyəti və təhsilə psixoloji xidmətin yaranması və inkişafı.

Məqalə ilə maraqlanan hər kəs öyrənmək imkanındadır ki, məktəbə psixoloji xidmətin əsası ilk dəfə 1896-cı ildə ABŞ-ın Pensilvaniya Universitetində, Rusiyada isə 1982-ci ildə qoyulmuşdur. Bu istiqamətdə aparılan tədqiqatlar nəticəsində 1985-ci ildə “Təhsil sistemində psixoloji xidmət haqqında Əsasnamə”nin layihəsi hazırlanmış, 1989-cu ildə qəbul edilib təsdiqlənmiş, 1995-ci ildə isə Rusiya Təhsil Nazirliyi Kollegiyasının 29 mart tarixli qərarı ilə yeni psixoloji xidmət sistemi yaradılmışdır.

Respublikamızda psixoloji xidmət sahəsində xeyli uğurlar qazanılmış olsa da, ixtisaslı kadrlarla təminat xeyli yaxşılaşsa da hələ də həllini gözləyən vacib məsələlər qalmaqdadır. Bura ilk növbədə “Əsasname”nin və hüquqi sənədlərin olmamasını, elmi-metodiki məsələlərin işlənməməsini və s. aid etmək olar. Müəllif məqaləsini respublikanın tanınmış psixoloq-alimi, professor Əbdül Əlizadənin aşağıdakı fikirləri ilə yekunlaşdırır: “XXI əsrdə Azərbaycan məktəbinin uğurları bütün başqa şərtlərlə yanaşı həm də psixoloji biliklərin məktəb təcrübəsində nə dərəcədə səriştə ilə gerçəkləşməsindən asılı olacaqdır. Bütün inkişaf etmiş ölkələrdə olduğu kimi, Azərbaycanda da məktəb öz öyüd-nəsihəti saatını gec-tez psixoloji ölçülər axarında köklənəcəkdir”.

“Heydər Əliyevin təhsil strategiyası və reallıqlar”. Ümumi pedaqogika kafedrasının müdiri, professor İramin İsayevin məruzəsi belə adlanırdı. Çıxışına Ulu Öndərin “Müəllimlər xalqın biliklənməsinin, təhsilin inkişaf etməsinin və nəhayət xalqın elminin inkişaf etməsinin əsasını qoyanlardır... Bizim hamımız həyatımızda əldə etdiyimiz nailiyyətlərə, bütün varlığımıza görə müəllimə borcluyuq” kəlmələri ilə başlayan məruzəçi Azərbaycanın bu dahi oğlunun təhsil strategiyası barədə konfrans iştirakçılarına ətraflı məlumat vermişdir. “Məhz Heydər Əliyevin təhsil strategiyasının düzgün dərkinin nəticəsidir ki, son illər Azərbaycan təhsilinin dünya təhsil məkanına birbaşa qoşulması prosesi müvəffəqiyyətlə davam etdirilir və cəmiyyətin inkişafına xidmət göstərən konseptual istiqamətlər müəyyən edilərək uğurlu nəticələr qazanılır. Bu istiqamətlərə müvafiq ölkəmizdə bütün elm və təhsil sahələri üzrə inkişaf strategiyası hazırlanaraq, gənc nəslin elmlərə sahib olması və ölkənin intellektual səviyyəsinin yüksəldilməsinə Heydər Əliyev konsepsiyasına xüsusi önəm verilməsi təsadüfi deyil. Elmi-texniki nailiyyətlərin təkcə iqtisadi istehsal sahələrində deyil, təhsildə, təlim-tədris prosesində geniş yer tutması, cəmiyyətdə yüksək intellektuallığın bərqərar olması, milli və ümumbəşəri dəyərlərin vətəndaş hazırlığında rolunun dəyərləndirilməsi, təhsilin məzmununun, təlimtərbiyə prinsiplərinin, metod və vasitələrinin təkmilləşdirilməsi yüksək intellekt və təfəkkür sahibi Ulu öndər Heydər Əliyevin uğurlu təhsil siyasətinin nəticəsi kimi qiymətləndirilməlidir” demişdir. Ümummilli Liderin XX əsrin 70-ci illərində Azərbaycan təhsili, Azərbaycan elmi üçün etdiklərindən söz açmışdır. Demişdir ki, “Keçən əsrin 70-ci illərindən ölkədə başlayan ictimai-siyasi dəyişikliklər, milli mənlik şüurunun formalaşması, milli təhsilin inkişafı, sosial-ictimai mühitdə özünü göstərən deformasiyaların aradan qaldırılması Heydər Əliyevin hakimiyyətə gəlməsi ilə özünü reallaşdırmağa başladı. Milli, müstəqil dövlətçilik naminə daima çırpınan ürək sahibi Heydər Əliyev milli şüur, əqidə, mənəviyyat kimi müqəddəs hisslərin insanlarda formalaşmasını təhsil siyasətinin düzgün qurulmasında görürdü. Təhsili dövlətçiliyin müqəddəs şərti hesab edən dahi şəxsiyyət bütöv həyatı və fəaliyyəti ərzində həmin amala sadiq qalaraq, insanlarda intellektual səviyyənin yüksəlməsini daima diqqət mərkəzində saxlamış, bu işdə xalqımıza məxsus tarixən formalaşdırılan milli təhsil ənənələrinə istinad olunması vacib şərt saymışdır”.

Natiqin çıxışında Heydər Əliyevin Azərbaycanda hakimiyyətə yenidən qayıdışından sonrakı dövr daha geniş və dolğun təhlil olunmuşdur. 1999-cu il iyun ayının 15-ində imzaladığı “Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı”nda Heydər Əliyev tərəfindən əsası qoyulan təhsil strategiyasının, milli ənənələrə, dünya təhsil standartlarına cavab verən, həm məzmun, həm də formaca daha mükəmməl təhsil sistemi yaradılması strategiyasının öz əksini tapdığını, müstəqil dövlətçiliyimizi möhkəmləndirəcək, inkişaf etdirəcək, qoruyub saxlaya biləcək yeni insan tərbiyəsinin Heydər Əliyev təhsil siyasətinin mühüm tərkib hissələrindən biri olduğunu söyləmişdir. “Fəxr edirəm ki, bizim Azərbaycanın gözəl-göyçək, istedadlı balaları, övladları var, fəxr edirəm ki, Azərbaycanın gələcəyi bu qədər gözəl təməl əsasında qurulur. Siz bugünkü həyatınızla, təhsilinizlə, öz istedadınızı inkişaf etdirməklə Azərbaycanın gələcəyinin binasını qurursunuz, böyük binanı qurursunuz. Müstəqil Azərbaycanın, daim müstəqillik içində yaşayan Azərbaycanın böyük binasını qurursunuz” kəlmələrini dilə gətirməklə Heydər Əliyevin Azərbaycan gəncliyinin milli-mənəvi dəyərlər ruhunda tərbiyəsinə üstünlük verdiyini konfrans iştirakçılarının diqqətinə çatdırmışdır.



Professor İramin İsayev çıxışının sonunda Ulu öndər Heydər Əliyevin təhsil strategiyasından irəli gələn vəzifələri davamçısı Respublika Prezidenti İlham Əliyev tərəfindən təxirəsalınmadan və uğurla davam etdirildiyini söyləmişdir. Məhz düzgün aparılan siyasətin nəticəsidir ki, - demişdir, - Ölkə Prezidenti İlham Əliyevin apardığı məqsədyönlü, davamlı dövlət siyasətinin nəticəsi olaraq vahid konsepsiya əsasında konkret dövlət proqramı hazırlanmış, “Təhsil haqqında” Azərbaycan Respublikası Qanunu, “Azərbaycan Respublikasında ümumi təhsilin konsepsiyası (Milli Kurikulumu)” təsdiq edilmiş, təhsilin normativ hüquqi bazası möhkəmləndirilmiş, infrastrukturun yeni tələblərə uyğun qurulması sahəsində əməli işlər həyata keçirilmiş və bu iş ardıcıl olaraq davam etdirilməkdədir. İnsanlara yeni texnologiyaları çevik mənimsətmək, əmək bazarında layiqli yer tutmaq, ömür boyu təhsil prosesinə qoşulmaq, yeni tələblərə uyğun bilik, bacarıq və vərdişlər formalaşdırmaq məqsədinin reallaşdırılması naminə Respublika Prezidenti İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli sərəncamı ilə “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın təsdiq edildiyini, bu dövlət sənədində beş istiqaməti (şəxsiyyətyönümlü təhsilin məzmununun yaradılmasını, innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən nüfuzlu təhsil verənlərin formalaşdırılmasını, təhsildə yeni idarəetmə sisteminin formalaşdırılmasını, müasir tələblərə cavab verən infrastrukturun, yeni maliyyələşdirmə mexanizminin yaradılması kimi qlobal problemləri) özündə birləşdirdiyini qeyd etmiş, davamlı olaraq həyata keçirilən bu strategiyanı Heydər Əliyev siyasətinin təhsildə uğurlu davamı kimi qiymətləndirmişdir.

***

Konfransda daha sonra pedaqogika üzrə fəlsəfə doktoru, dosent Sahilə Orucova, psixologiya üzrə fəlsəfə doktoru Ülviyyə Əfəndiyeva, psixologiya üzrə fəlsəfə doktoru Məhərrəm Əliyev, I kurs magistrantı Sevinc Məmmədova, II kurs tələbəsi Könül Quliyeva və başqaları çıxış etmişlər.

**Ayətxan Ziyatxanoğlu**

# ADPU-nun Elmi kitabxanasına hədiyyə

***Azəbaycan Milli Elmlər Akademiyasının Milli Azərbaycan Tarix Muzeyi Azərbaycan Dövlət Pedaqoji Universitetinin Elmi kitabxanasına müxtəlif kitabları hədiyyə etmişdir. Həmin kitabların siyahısını dərc edirik:***

1. Ümummilli lider Heydər Əliyevin anadan olmasının 90 illiyinə həsr olunmuş “Azərbaycan tarixinin öyrənilməsində muzeylərin rolu” III Respublika elmi konfransının materialları. Bakı, ”Ziya”, 2013, 272 səh.

2. Milli Azərbaycan Tarixi Muzeyi. Bakı, ”Ziya”, 2013, 368 səh.

3. Azərbaycanda kağız pul nişanları və qiymətli kağızlar. Kitab-albom (Milli Azərbaycan Tarixi Muzeyinin Köməkçi Tarixi Fənn Materialları Fondunun Bonistika kolleksiyası əsasında). Bakı, ”Ziya”, 2013, 96 səh.

*Kitab-albomda Milli Azərbaycan Tarixi Muzeyinin Köməkçi Tarixi Fənn Materialları Fondunun Bonistika bölməsində saxlanılan, Azərbaycanda dövriyyədə olmuş və bu gün də işlədilən kağız pullar, səhmlər, istiqrazlar və digər qiymətli kağızlar təqdim olunur.*

4. Bakı, Şirvan, Quba xalçaları. Kataloq (Milli Azərbaycan Tarixi Muzeyinin kolleksiyasından). Bakı, ”Ziya”, 2013, 176 səh.

5. Azərbaycanın arxeoloji qızıl və gümüş əşyaları. Kataloq. Bakı, ”Ziya”, 2013, 100 səh.

6. Əziz Əliyev. Kataloq. Bakı, ”Ziya” NPM, 2013, 88 səh.

*Kataloqda Ə.M.Əliyevin həyat və fəaliyyəti ilə bağlı 60-dan artıq eksponat barədə müfəssəl məlumat verilir, həmin eksponatların görkəmli şəxsiyyətin bioqrafiyasının naməlum qalan məqamlarının araşdırılmasında yeri və rolu qeyd olunur.*

7. Bakının teatr həyatı. Kataloq. Bakı, ”Ziya”, 2013, 212 səh.

Kataloqda Bakı teatrlarının tarixinə dair Milli Azərbaycan Tarixi Muzeyinin fondlarında qorunan eksponatlar təqdim olunur.

8. Azərbaycan süfrəsinin mis qabları. Kitab-albom (Milli Azərbaycan Tarixi Muzeyinin materialları əsasında). Bakı, “Ziya”, 2013, 128 səh.

9. Qarabağ xalçaları. Kataloq. Bakı, “Ziya”, 2013, 100 səh.

10. XIX əsr - XX əsrin birinci yarısı Azərbaycan maarifçiliyi və maarifçiləri (məqalələr toplusu). Bakı, “Ziya”, 2013, 144 səh.

11. Nəsib bəy Yusifbəyli - milli istiqlal və dövlətçilik mücahidi (Azərbaycan Xalq Cümhuriyyətinin 95-ci ildönümünə ithaf olunur). Bakı, “Ziya”, 2013, 216 səh.

12. Müasirləri Hacı Zeynalabdin Tağıyev haqqında. Bakı, “Ziya” NPM, 2013, 206 səh.

*Kitabda görkəmli xeyriyyəçi, sahibkar Hacı Zeynalabdin Tağıyev haqqında onun müasirləri olmuş insanların xatirələri və oçerkləri toplanmışdır.*

13. Milli Azərbaycan Tarixi Muzeyinin “Nadir kitablar fondu”nun biblioqrafik göstəricisi (1728-1860), I cild. Bakı, “Ziya”, 2013, 164 səh.

14. Vyaçeslav Səmədov. “Xəzər neftdaşıma donanması” (1874-1917), (kitab rus dilindədir). Bakı, “Ziya”, 2013,192 səh.

**Nüşabə ƏMRƏLİYEVA,**
**Elmi kitabxananın biblioqrafiya şöbəsinin müdiri**

# AZƏRBAYCAN TƏHSİLİNDƏ PEŞƏ ORİYENTASİYASI

## ADPU bu istiqamətdə səmərəli fəaliyyət göstərir



***Qəzetimiizin aprel sayında ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun müvafiq əmri əsasında "ADPU-nun 2013-2014-cü tədris ilində tələbə qəbulu ilə əlaqədar peşə oriyentasiyası ilə bağlı Tədbirlər planı"na uyğun olaraq Tarix fakültəsinin, Pedaqoji fakültənin, Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin, Filologiya fakültəsinin, həmçinin Pedaqogika və psixologiya fakültəsinin professor-müəllim heyətinin, tanınmış məzunlarının və tələbələrinin Bakı şəhərinin müxtəlif məktəb və liseylərində keçirdikləri görüşlər haqqında məlumat vermişdik. Bu sayımızda isə Kimya, Biologiya və Fizika fakültələrinin Bakının ayrı-ayrı məktəb və liseylərində keçirdikləri görüşlər barədə yazıları təqdim edirik. Xatırladaq ki, ADPU-nun professor-müəllim heyətinin və tanınmış məzunlarının keçirdikləri bu görüşlər həm də Pedaqoji Universitetdə olan ixtisasları təbliğ etmək məqsədinə xidmət edir.***

### Kimya fakültəsinin kollektivi və tanınmış məzunları Heydər Əliyev adına Liseydə

Bu il may ayının 2-də Kimya fakültəsinin professor-müəllim heyəti, tanınmış məzunları və tələbələri Bakı şəhərinin Xətai rayonundakı Heydər Əliyev adına Liseyin buraxılış siniflərinin şagirdləri ilə görüş keçirmişlər. Görüşdə fakültənin dekan müavini, dosent Ədilə Mahmudova, Analitik və fiziki kimya kafedrasının müdiri, professor Nailə Verdizadə, professor Telman Ağdamski, dosent Kərim Quliyev, kimya üzrə fəlsəfə doktoru Rəhimə Məmmədova, dosent Aysəba Məmmədova iştirak etmişlər. Görüşdə həmçinin Kimya fakültəsinin görkəmli məzunları, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Yusif Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutunun direktoru, AMEA-nın müxbir üzvü, professor, Əməkdar müəllim Vaqif Abbasov və həmin institutun aparıcı elmi işçisi, pedaqogika üzrə elmlər doktoru, Əməkdar müəllim Mütəllim Abbasov da iştirak etmişlər.

İlk olaraq Heydər Əliyev adına Liseyin direktoru Fikrət Xəlilov görüşdə iştirak edən müəllimləri, tələbələri, şagirdləri salamlamış və şagirdlərlə belə görüşlərin təşkil olunmasının əhəmiyyətindən danışmışdır. Sonra çıxış etmək üçün söz professor Vaqif Abbasova verilmişdir. Professor V.Abbasov şagirdlərə müəllimlik peşəsinin ucalığından, böyüklüyündən, kimya elminin həyatımızın ayrılmaz hissəsi olduğundan danışmış və şagirdlərə peşə seçimində səhv etməməyi tövsiyə etmişdir. Dosent Ə.Mahmudova, professor N.Verdizadə, professor T.Ağdamski hər biri öz çıxışı zamanı şagirdlərə kimya elminin nailiyyətlərindən, həmçinin müəllimlik peşəsinin şərəfli, eyni zamanda məsuliyyət tələb edən bir peşə olmasından danışmış, şagirdlərə sevdikləri peşəyə yiyələnməyi arzu etmişlər.

Kimya fakültəsinin IV kurs tələbəsi Aynur Novruzova qısa tanıtım çarxı ilə çıxış edərək, fakültəni şagirdlərə təqdim etmişdir. O, fakültənin məşhur məzunları, kafedraları, professor-müəllim heyətinin pedaqoji fəaliyyəti, imtahan sisteminin şəffaflığı barədə şagirdlərə məlumat vermiş, hər bir şagirdə gələcəkdə tələbə adını qazanmağı arzulamışdır. Fakültənin digər IV kurs tələbəsi Aydəniz Talıblı "Əziz müəllimim" adlı mahnını oxumaqla müəllimlərə öz minnətdarlıq hissini ifadə etmişdir. Tədbirdə fakültənin əməkdaşı Səkinə Əsədova, tələbələrmizdən Günel Əliyeva, Fikrət Bədəlov və başqaları da iştirak etmişlər.

Tədbirin sonunda dekan müavini, dosent Ə.Mahmudova Liseyin direktoru F.Xəlilova şagirdlərlə görüşün təşkil edilməsində göstərdiyi köməkliyə görə fakültənin kollektivi adından təşəkkürünü bildirmiş və Liseyin kitabxanasına fakültənin kimya kitablarından hədiyyə etmişdir.

Liseyin direktoru F.Xəlilov isə bu görüşün şagirdlərin gələcək həyatlarında böyük rol oynayacığını söyləmiş, görüşün təşkil olunmasında əməyi olan hər kəsə öz minnətdarlığını bildirmiş və belə görüşlərin davamlı olmasını arzulamışdır.

**Fikrət BƏDƏLOV,**
**Kimya fakültəsinin**
**IV kursunun**
**401-ci qrup tələbəsi**

# Biologiya fakültəsinin kollektivi 49 nömrəli İntellekt Liseyində

Aprel ayının 30-da ADPU-nun Biologiya fakültəsinin professor-müəllim və tələbə heyəti Bakı şəhərinin Səbail rayonundakı 49 nömrəli İntellekt Liseyində buraxılış siniflərinin şagirdləri ilə "Müqəddəs müəllimlik peşəsi müasir təhsilimizin fonunda" adlı görüş keçirmişdir. Görüşdə fakültənin dekanı, professor Yusif Əhmədov, Biologiyanın tədrisi metodikası kafedrasının dosentləri Əliyənnağı Məhərrəmov, Həqiqət Hacıyeva, Gülşən Hacıyeva (bu məktəbin məzunu olmuş və həmin məktəbdə bir müddət Biologiya müəllimi kimi fəaliyyət göstərmişdir), baş müəllimləri Elmira Hacıbəyova, İmran Kazımov, III kurs tələbələri Xatirə Abdullayeva və Röya Əsgərli iştirak etmişlər. Görüşün məqsədi müəllim peşəsinin həm şərəfli, həm də məsuliyyətli bir peşə olduğunu gələcəyimizin qurucuları olan şagirdlərə çatdırmaq idi. Qeyd edək ki, bu görüş ali məktəblərin orta təhsil müəssisələri ilə qarşılıqlı əlaqələrinin yaradılması və inkişafı baxımından mühüm əhəmiyyət kəsb edir. Məlumat üçün onu da bildirək ki, bu intellekt-lisey biologiya təmayüllü olduğuna görə ADPU-nun Biologiya fakültəsi tərəfindən karyera mərkəzi kimi seçilmişdir.

Görüşü 49 nömrəli İntellekt Liseyin direktoru Təhminə Əsədova açaraq görüş iştirakçılarını salamlamış və ADPU-nun Biologiya fakültəsinin başçılıq etdiyi təhsil müəssisəsi ilə əlaqələrindən söhbət açmışdır. O, qeyd etmişdir ki, bu əlaqələr çoxdan yaranmışdır. Belə ki, hər il Biologiya fakültəsinin tələbələri bu məktəbdə pedaqoji təcrübə keçirlər. Məktəbdə onlara hər cür şərait yaradılır və bu müştərək işdən hər iki tərəf bəhrələnir. T.Əsədova müəllim peşəsinin müqəddəs və məsuliyyətli bir peşə olduğunu vurğulayaraq demişdir: "Müəllimlik-həyatda ən gözəl sənətdir, mənə əlavə bir ömür də versəydilər, yenə müəllim olardım. Müəllim savadlı, bilikli, hərtərəfli olmalıdır. Mən öz xöşbəxtliyimi müəllimlikdə tapmışam".

Görüşdə çıxış edən Biologiya fakültəsinin dekanı, professor Yusif Əhmədov yuxarı sinif şagirdlərinə ADPU-nun yaranma tarixi, keçdiyi inkişaf yolu, görkəmli məzunları və bu ali məktəbdə təhsilin bugünkü səviyyəsi haqqında ümumi məlumat vermişdir. Professor Y.Əhmədov bildirmişdir ki, bu gün ADPU-ya xalqımızın görkəmli alim və ziyalısı, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov rəhbərlik edir. ADPU son illər ali təhsil sahəsində bir çox uğurlar qazanmışdır.

Professor Y.Əhmədov öz çıxışında Biologiya fakültəsi, onun tarixi, görkəmli məzunları, kafedraları, laboratoriyaları, bakalavr və magistr pilləsi üzrə tədris olunan fənnlər haqqında geniş məlumat vermişdir. Professor Y.Əhmədovun Biologiya fakültəsinin strukturu və eləcə də əməkdaşları haqqında şəkillərin nümayişi ilə verdiyi məlumatlar şagirdlər tərəfindən maraqla qarşılandı.

Professor Y.Əhmədov həm də öz çıxışında Biologiya fakültəsinin müxtəlif illərdə coğrafiya, kimya ixtisasları ilə əlaqəli fəaliyyət göstərdiyini, son illər isə müstəqil bir fakültə kimi fəaliyyət göstərdiyini qeyd etmişdir. Eyni zamanda o, ADPU-nun məzunları olan məşhur elm və dövlət xadimlərinin, görkəmli pedaqoqların, akademiklərin, professorların adlarını çəkmiş, onların cəmiyyətimizin, elmimizin inkişafındakı xidmətlərindən danışmışdır.

Dosent Ə.Məhərrəmov çıxış edərək bu məktəbin bizə çox doğma olduğunu, öz ab-havası və nizam-intizamı ilə seçildiyini, hər gəlişdə burada kollektivin, şagirdlərin münasibətində bir istilik, qarşılıqlı hörmət gördüyünü bildirdi. O, qeyd etdi ki, bugünkü məktəblilər bizim gələcəyimizdir. Dosent Ə.Məhərrəmov şagirdləri ADPU-ya oxumağa dəvət etdi və "Müəllim adını yüksək tutun" -dedi

Sonra söz dosent H.Hacıyevaya verildi. O, şagirdləri fəal olmağa və düzgün peşə seçimi etməyə çağırdı. Müəllimlik sənətinin çətin və şərəfli olduğunu dedi və şagirdləri ADPU-ya oxumağa dəvət etdi.

Görüşdə çıxış edən dosent G.Hacıyeva bu məktəbin məzunu olduğunu, ADPU-nu bitirdikdən sonra yenə doğma məktəbinə qayıdaraq bir müddət Biologiya müəllimi kimi fəaliyyət göstərdiyini, sonradan ADPU-nun aspirantı olaraq dissertasiya müdafiə etdiyini, elmi dərəcə aldığını, hazırda isə ADPU-nun dosenti vəzifəsində işlədiyini və müəllimlik sənətini çox sevdiyini şagirdlərə çatdırdı.

Baş müəllim İ.Kazımov şagirdlərə izah etdi ki, ADPU-nu bitirdikdən sonra onların fəaliyyəti yalnız orta məktəb müəllimi kimi məhdudlaşmaya bilər. Yəni ADPU-nu bitirdikdən sonra qarşınızda geniş imkanlar açılacaqdır.

Sonra ADPU-nun III kurs tələbəsi Xatirə Abdullayeva burada oxuyan tələbələr üçün hər cür şəraitin, əlverişli mühitin yaradıldığını bildirdi və müəllim olacağı üçün sevindiyini vurğuladı. O, öz fikrini belə ifadə etdi: "Müəllim cəmiyyətimizin nurudur, işığıdır. Müəllim peşəsi müqəddəsdir. O, bizim həyatımıza istiqamət verəndir".



Məktəbin Biologiya müəllimi Nərgiz xanım çıxış edərək ADPU-nun müəllimləri ilə bu görüşdən məmnun olduğunu qeyd etdi və iştirakçılara öz təşəkkürünü bildirdi.

Keçirilən görüş nəticəsində yuxarı sinif şagirdləri həm bütövlükdə ADPU, həm də Biologiya fakültəsinin fəaliyyəti haqqında geniş məlumatlandırıldılar.

Biologiya fakültəsinin dekanı, professor Y.Əhmədov görüşün keçirilməsi üçün göstərdiyi köməkliyə görə fakültənin kollektivi adından məktəbin rəhbərliyinə öz təşəkkürünü bildirdi.

Sonda xatirə şəkilləri çəkdirildi.

**Əminə ZEYNALOVA,**
**Biologiya fakültəsinin**
**III kursunun 302-ci qrup tələbəsi**

# Tələbə Gənclər Təşkilatı 9 yaşını qeyd edib




May ayının 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatı (TGT) 9 yaşını qeyd edib. Tədbir Tələbə Gənclər Təşkilatının İdarə Heyətinin hazırladığı rəqslə start götürüb, rəqsdən sonra isə maraqlı videoçarx təqdim olunub.

Sonra bir il ərazində TGT-nin gördüyü işlərlə bağlı hesabatı təqdim etmək üçün təşkilatın sədri Sahil Qələndərov səhnəyə dəvət olunub. Sədr hesabat zamanı keçirilmiş layihələr, iştirak edilmiş tədbirlər, təşkilatın nailiyyətləri haqqında məlumat verib. Həmçinin S.Qələndərov təşkilatın tərkibində fəaliyyət göstərən klublar - "Ekoklub", "Debat klubu", "İntellektual klub" haqqında məlumat verib.

ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev öz çıxışında təşkilatın fəaliyyəti haqqında danışmış, görülən tədbirləri müsbət qiymətləndirmiş və TGT-yə gələcək fəaliyyətində uğurlar arzulamışdır.



Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) sədrinin müşaviri Cəmil Hüseynov təmsil etdiyi qurumla ADPU-nun TGT-nin birgə gördüyü işlərdən danışıb və İttifaq daxilində adıçəkilən TGT -nin hər zaman fəallığı ilə seçildiyini vurğulayıb.

Çıxışlardan sonra universitetimizin ən fəal tələbələrinə fəxri fərmanlar təqdim olunub.

Tədbir tələbələrin musiqi ifaları ilə davam edib.

**Rasim Abdurəhmanov.**
**II kurs magistrantı**

# ADPU-da "SABAH" qruplarının təqdimatı keçirilib

May ayının 13-də ADPU-da "SABAH" qruplarının təqdimatı keçirilib. Təqdimatda Təhsil Nazirliyinin Aparat rəhbərinin müavini Yaqub Piriyev və "Sabah" qrupları üzrə koordinator Elçin Ağakişiyev iştirak etmişlər. Yığıncağı ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov açmış, "SABAH" qruplarının ölkəmizin gələcək həyatında oynayacağı əhəmiyyətli roldan, burada təhsil alacaq tələbə-gənclər üçün Azərbaycan hökuməti tərəfindən yaradılacaq üstün şəraitdən, qayğı və diqqətdən bəhs etmiş, dövlət tərəfindən




hər cür qayğı ilə əhatə olunacaq "SABAH" qrupları tələbələrinin təhsillərini başa çatdırandan sonra işlə təminatları probleminin də dövlət tərəfindən həll olunacağından söz açmışdır. Təqdimatda bildirilmişdir ki, "SABAH" qrupları öz ixtisası üzrə peşəkar mütəxəssis kimi yetişmək istəyən gənclər üçün geniş imkanlar açır. Bu qruplara daxil olan tələbələr həm yüksək səviyyəli təhsil almaq imkanı qazanacaq, həm də təhsil müddətində əlavə təqaüd, yataqxanada pulsuz yerləşdirilmə, qidalanma kimi bir sıra maddi imtiyazlara malik olacaqlar. Sürətlə qloballaşan dünyada müasir baxışlar, yüksək təhsil, bir neçə dil biliyi tələbənin gələcəkdə iş tapmaq, uğurlu karyera qurmaq şansını əhəmiyyətli dərəcədə artırır. Bunu nəzərə alaraq, "SABAH" qruplarına qəbul olan tələbə oxuduğu ixtisasın ən yüksək səviyyədə tədrisinin təşkil olunduğu ali təhsil müəssisəsinə köçürüləcək, onların istəklərinə uyğun çevik tədris proqramı tətbiq olunacaq. Təhsil müddətində xarici ölkə universitetləri ilə mübadilələr, əsas işəgötürənlərlə mütəmadi əlaqələrə böyük önəm veriləcək. "SABAH" qruplarının məzunları öz ixtisasını ana dili ilə yanaşı, ingilis dilində də mükəmməl biləcək. Qrupun fərqlənən tələbələri xarici ölkələrə təcrübəyə göndəriləcək.

Yığıncaqda çıxış edən Təhsil Nazirliyinin Aparat rəhbərinin müavini Yaqub Piriyev ADPU-nun tələbələrinə və professor-müəllim heyətinə "SABAH" qruplarının yaradılmasının əhəmiyyətindən danışarkən bu qrupların respublikamızda təhsilin keyfiyyətinin daha da artırılması, tələbələr arasında sağlam rəqabətin formalaşması və müasir tələblər səviyyəsində kadrların hazırlanması zərurətindən yaradıldığını söyləmişdir. Demişdir ki, may ayının 13-dən etibarən "SABAH" qruplarında təhsil almaq istəyən tələbələrin qeydiyyatına başlanılmışdır. Arzusunda olanlar **www.sabah.edu.az** saytında elektron qeydiyyata düşə bilərlər. Qeydiyyat iyun ayının 12-nə qədər davam edəcəkdir.

"SABAH" qruplarına qəbul olmaq istəyən tələbə üç mərhələdən keçməlidir. I mərhələ, yeni sənədlərin qəbulunda il ərzində qiymətlərinin orta göstəricisi 61-dən aşağı olmayan I kurs tələbələri iştirak etmək hüququna malikdirlər. Qeydiyyatdan keçən tələbə ikinci mərhələdə 25 məntiq və 25 xarici dil olmaqla 50 sualı cavablandıracaq. Üçüncü mərhələdə isə tələbələr üçün şifahi müsahibə təşkil ediləcək Bu mərhələləri daha yüksək nəticə ilə keçənlər "SABAH" qrupunun tələbəsi olmaq imkanı qazanacaq və ikinci kursdan etibarən ixtisaslarına uyğun baza ali təhsil müəssisəsində təhsillərini davam etdirəcəklər".

"SABAH" qrupları 33 ali təhsil müəssisəsindən 8-nin bazasında yaradılacaq və 52 ixtisas olmaqla 5 ixtisas qrupunu, ümumilikdə isə 20 minə yaxın tələbəni əhatə edəcək. Çıxışında ADPU-da yaradılacaq ixtisaslardan daha geniş bəhs edən Y.Piriyev Pedaqoji Universitetdə üç ixtisas üzrə - "İbtidai sinif müəllimliyi, Tarix və coğrafiya müəllimliyi", Riyaziyyat və infotmatika müəllimliyi" ixtisasları üzrə təhsil veriləcəyini söyləmiş, "SABAH" qruplarında təhsil alacaq tələbələri hansı üstünlüklər gözləyir?" sualını cavablandırarkən demişdir: "Hər bir ixtisasın "SABAH" qrupu həmin ixtisas üzrə ən yaxşı göstəricilərə malik ali təhsil müəssisəsində yerləşəcək. Aztəminatlı tələbələr isə yataqxana və yeməklə təmin olunacaqlar. Ödənişli və ya dövlət hesabına oxumasından asılı olmayaraq, "SABAH" qruplarında təhsil alan tələbələr xüsusi təqaüd alacaqlar. Tədrisi aparan müəllimlər həm yerli, həm də əcnəbi müəllimlər olacaq. Əcnəbi müəllimləri "SABAH" qruplarına cəlb etməklə azərbaycanlı gənclər üçün respublikamızda xaricdəki kimi təhsil mühiti yaratmaq niyyətindəyik. "SABAH" qruplarında təhsil alacaq tələbələr ixtisaslarını dəyişə bilməzlər, onlar təhsil aldıqları ali məktəbdə ödənişli qrupdadırlarsa ödənişli, dövlət təminatı ilə təhsil alırlarsa, dövlət təminatı ilə də təhsil alacaqlar. Tələbə hansı ali təhsil müəssisəsinin "SABAH" qrupunda təhsil alırsa, həmin ali məktəbin də diplomunu alacaq. Bu qruplarda təhsil almaq üçün dövlət ali təhsil müəssisələrinin tələbələri ilə yanaşı, özəl ali məktəblərin tələbələri də müraciət edə biləcək. Növbəti tədris ilindən 1300 tələbə II kursdan etibarən "SABAH" qruplarında təhsil almaq imkanı qazanacaq".



Təhsil Nazirliyinin Aparat rəhbərinin müavini Y.Piriyev və "Sabah" qrupları üzrə koordinator Elçin Ağakişiyev "SABAH" qruplarında təhsil almaq arzusunda olan universitetimizin tələbə-gənclərinin onlayn qeydiyyatının **www.sabah.edu.az** saytı vasitəsilə aparıldığını söyləmiş, **www.sabah.edu.az** saytına müraciət etməklə "SABAH" qruplarının qəbul qaydaları, seçim şərtləri və digər məsələlər barədə ətraflı məlumat əldə edəcəklərini söyləmişlər.

Sonda tələbələri maraqlandıran çoxlu sayda suallar cavablandırılmışdır.

**Ayətxan Ziyad**

# Fizika fakültəsinin kollektivi 18 nömrəli tam orta məktəbdə

Peşə oriyentasiyası ilə əlaqədar may ayının 27-də keçirilən bu görüşdə ADPU-nun Fizika fakültəsinin dekanı, fizika-riyaziyyat üzrə elmlər doktoru, professor, Əməkdar müəllim, "Şöhrət" ordenli Mirzəli Murquzov, dekan müavini, dosent Xəlil Padarov, Fizikanın tədrisi metodikası kafedrasının müdiri, dosent Rasim Abdurrazaqov iştirak edirdilər.

Görüşü 18 nömrəli tam orta məktəbin direktoru, Əməkdar müəllim Vaqif Hüseynov açaraq, görüşün məqsəd və məramını məktəblilərə, məktəbin pedaqoji kollektivinə açıqladı: "Bugünkü görüş həqiqətən qeyri-adi görüşdür. Yaşlı müəllimlər yaxşı xatırlayırlar: 25-30 il əvvəl ali məktəblərin pedaqoji kollektivləri təbliğat məqsədi ilə orta məktəblərdə görüşlər keçirirdilər. Bu səfərlərdə bir niyyət güdülürdü-məktəblilər bilsinlər ki, hansı ali təhsil müəssisəsində hansı ixtisaslar üzrə mütəxəssislər hazırlanır. Bu hal orta məktəb məzunlarının peşə seçiminə aydınlıq gətirir və onların peşə seçimlərində əhəmiyyətli rol oynayırdı. Yaxşı haldır ki, hazırda Təhsil Nazirliyi bu kimi ənənələri gündəmə gətirib. Məsələ qaldırıb ki, respublika ali məktəblərinin fakültələri hər hansı bir orta məktəbi hamiliyə götürsün. Bizim də bəxtimiz onda gətirib ki, ADPU-nun Fizika fakültəsi bizim 18 nömrəli tam orta məktəbi hamiliyə götürüb".

Rəhbərlik etdiyi məktəb haqqında məlumat verərkən bu məktəbin təxminən bir əsrə qədər yaşı olduğunu və "İlin ən yaxşı məktəbi" nominasiyası üzrə respublika müsabiqəsinin qalibi olduğunu söyləyən direktor V.Hüseynov çıxışında dedi ki, məktəbimizdə fizika fənninin tədrisi, həqiqətən diqqəti cəlb edir. Belə ki, pedaqoji kollektivin 6 üzvü - Azər Səmədov, Afaq Axundova, Nərminə Qaragözova, Gültəkin Qayayeva, Aynur Mustafayeva və Rəna Ağazadə "İlin ən yaxşı müəllimi" adını qürurla daşıyırlar. ADPU ilə bizi bağlayan doğma tellər çoxdur. Elə mən özüm ADPU-nun məzunuyam. Mirzəli müəllimlə paralel rus bölməsində təhsil almışam. Məktəbimizin müəllimlərindən Gülnaz Məmmədova, Rauf Əzizov, Sevda Əsgərova, Rəna Rzayeva ADPU-nun məzunlarıdır. Pedaqoji Universitetin tələbələri uzun illər məktəbimizdə pedaqoji təcrübədə olublar. Biz də öz növbəmizdə onların pedaqoji təcrübələrinin yüksək səviyyədə keçmələri üçün hər cür şərait yaratmışıq. Məktəbimizdə tədrisin yüksək səviyyədə olduğunu təsdiq edən bir faktı deyim: iki məzunumuz hazırda Türkiyədə, biri Koreyada, daha biri isə Almaniyada yaşayıb-işləyir.



Direktor V.Hüseynov dedi: "Məktəbimizdə fizika elminin tədrisi ilə bağlı uğurlarımız yaddaqalandır. Müxtəlif illərdə ayrı-ayrı respublika olimpiadalarında məktəblilərimizin qalib yerləri tutmaları söylədiyim fikrin təsdiqi üçün kifayət edər. Hətta olimpiadalara qatılmağı xoşlamayan bir məzunumuz-Əmirəliyev Qalib Firidun oğlu 620 bal ilə Azərbaycan Dövlət Tibb Universitetinə qəbul olunmuşdur. Biz məktəbimizin adını ucaldan belə məzunlarımızla, müəllim işinin incəliklərinə dərindən bələd olan və öz peşəsini şagirdlərinə sevgi ilə öyrədən müəllimlərimizlə qürur duyuruq".

Sonra məktəbin müəllimlərindən, professor M.Murquzovun magistrantı olmuş Rəna Rzayeva, ADPU-nun məzunlarından olan fizika müəllimi Rauf Əzizov, fizika müəllimi olmaq arzusu ilə yaşayan və elə bu niyyətlə də ADPU-nu seçmiş XI sinif şagirdi Nülufər Quliyeva və başqaları çıxış etdilər. Məktəbin Fizika metodbirləşməsinin sədri Azər Səmədov çıxışında dedi: "Güman edirəm ki, ADPU ilə olan sıx əlaqələrimiz gələcəkdə şagirdlərimizin müəllim ixtisasını seçmələrinə səbəb olacaq. Çünki bunun üçün bizdə zəmin var - şəraitimiz gözəldir, savadlı, öz işini bilən müəllimlərimiz çoxdur".

Fizika fakültəsinin dekan müavini, dosent X.Padarov və kafedra müdiri, dosent R.Abdurrazaqov çıxış edərək ADPU və Fizika fakültəsi haqqında zala toplaşmış müəllim və məktəbliləri məlumatlandırdılar.

Sonda fakültənin dekanı, professor M.Murquzov çıxış etdi.

Mirzəli müəllimin slaydla müşayiət olunan çıxışından 18 nömrəli məktəbin müəllim və şagird heyəti ADPU-nun tarixi, fakültələri, burada fəaliyyət göstərən elmi-pedaqoji kadr potensialı haqqında, xüsusilə Fizika fakültəsinin tarixi, kafedraları, elmi-tədqiqat laboratoriyaları, fakültədə verilən ixtisaslar, müəllim və tələbələr, fakültənin tanınan, şöhrətli məzunları, ayrı-ayrı illərdə fakültəyə rəhbərlik etmiş ziyalılar haqqında geniş, məzmunlu məlumat aldılar.

Təbliğat xarakterli bu çıxışında Mirzəli müəllim məktəblilərə üz tutaraq dedi ki, indiyədək biz fizika elmini təbiət elmi adlandırırdıq, artıq o, həyat elmi olubdur. Bu mənada fizika butun sahələri özündə birləşdirir. Yaxınlarda mötəbər toplantıların birində təklif etdim ki, müəllim ixtisasını seçən abituriyentlər üçün onun təhsil aldığı məktəbin təqdimatı olsun, çünki müəllim peşəsi elə bir sahədir ki, bu sənəti özü üçün seçim edən şəxslər öyrətmək qabiliyyətləri ilə digərlərindən fərqlənməlidirlər. Mən belə hesab edirəm ki, bizim bugünkü görüşümüzdən siz məktəblilər nəticə çıxaracaq, öz peşə seçiminizdə müəllimlik işinə üstünlük verəcəksiniz. Sizin hər birinizə hansı ixtisası seçməyinizdən asılı olmayaraq, uğurlar arzulayıram".

Sonra məktəbin müəllimlərinə 93 yaşlı ADPU-nun və Fizika fakültəsinin şərəfli tarixi yolunu və bu gününü əks etdirən bukletlər paylandı, şagirdlərin ifasında görüntülənən fizika elminə həsr edilmiş klip nümayiş etdirildi.

Tədbirə yekun vuran direktor V.Hüseynov 18 nömrəli tam orta məktəbi baza müəssisəsi olaraq seçdiklərinə görə ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədova və Fizika fakültəsinin kollektivinə öz minnətdarlığını bildirdi.

**A.Ziyad**

# ”Müəllimlər hər cür zorakılığa qarşı” mövzusunda konfrans

Mayın 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) ”Müəllimlər hər cür zorakılığa qarşı” mövzusunda konfrans keçirilib. ”Zəngin Azərbaycan uğrunda mübarizə” İctimai Birliyi, Azərbaycan Jurnalist Qadınlar Assosiasiyası və ADPU-nun birgə təşkilatçılığı ilə keçirilən tədbirdə universitetin professor-müəllim heyəti, tələbələri, bir sıra dövlət qurumlarının nümayəndələri, qeyri-hökumət təşkilatlarının təmsilçiləri, paytaxt məktəblərinin tanınmış müəllimləri iştirak ediblər.



Konfransı ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev giriş sözü ilə açaraq universitetin qeyri-hökumət təşkilatları ilə birgə mütəmadi olaraq bir sıra tədbirlər həyata keçirdiyini bildirib. Bugünkü tədbirin olduqca aktual bir mövzuya həsr olunduğunu deyən prorektor V.Əliyev müəllimliyə xas olan keyfiyyətlərdən söz açıb, gələcəyin müəllimləri olacaq tələbələrə bir sıra tövsiyələr verib.

”Zəngin Azərbaycan uğrunda mübarizə” İctimai Birliyinin sədri, ADPU-nun İqtisadi və sosial fənlər kafedrasının baş müəllimi İradə Əliyeva konfransın əsas məqsəd və məramından danışıb.

Azərbaycan Jurnalist Qadınlar Assosiasiyasının prezidenti Sevil Yusifova hər cür zorakılığa qarşı mübarizədə müəllimlərin rolunun vacibliyini vurğulayıb. Qeyd edib ki, uşaqlarımızın, yeniyetmə və gənclərimizin düzgün formalaşmasında, cəmiyyətimiz üçün yararlı bir vətəndaş kimi yetişməsində bağçanın, məktəbin, ali və orta ixtisas təhsili müəssisələrinin rolu olduqca böyükdür.

Sonra Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin əməkdaşı Əliheydər Zülfüqarlı ”Dində zorakılıq haqqında”, ADPU-nun Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev ”Zorakılığa qarşı münasibətin formalaşmasında müəllimlərin rolu”, Azərbaycan ədəbiyyatı tarixi kafedrasının dosenti Təranə Rəhimli ”Azərbaycan ədəbiyyatında qadınlara qarşı zorakılıq məsələsi” mövzularında məruzələrlə çıxışlar ediblər.

Konfransda daha sonra qeyri-hökumət təşkilatları təmsilçilərinin, müəllimlərin, tələbələrin iştirakı ilə müzakirə olunan mövzu ətrafında geniş və səmərəli fikir mübadiləsi aparılıb.

**“Gənc müəllim”**

# ADPU-da “Açıq qapı” günü

***May ayının 15-də keçirilən tədbir belə adlanırdı. “Açıq qapı” gününə Bakı şəhərinin müxtəlif orta məktəblərinin buraxılış siniflərinin şagirdləri qatılmışdılar***

***“Azərbaycan Dövlət Pedaqoji İnstitutu böyük və çətin yol keçmişdir. Onun kollektivi Azərbaycan ümumtəhsil məktəbinin inkişafında böyük xidmət göstərmiş, institut xalq maarifi üçün yüksək ixtisaslı kadrlar ocağına çevrilmişdir”.***

**Heydər Əliyev,**
**ümummilli lider**

Tədbiri giriş sözü ilə ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov açmış, görüşün məqsədi barədə məktəbliləri, qonaqları məlumatlandırmışdır. ADPU-da “Açıq qapı” günü keçirilməsini yeni ənənənin başlanğıcı kimi dəyərləndirən professor M.Cəbrayılov çıxışında demişdir: “Görüşdə məqsəd builki orta məktəb məzunlarına ADPU haqqında, onun tarixi, fakültələri, bu ali məktəbdəki ixtisaslar, dərs deyən respublikanın tanın-




mış elm və təhsil xadimləri, ADPU-nun məzunları olan respublikanın tanınan ziyalıları haqqında məlumat vermək yeni qəbul qaydaları ilə əlaqədar olaraq universitetdə fəaliyyət göstərən qəbul komissiyanın fəaliyyəti ilə ali məktəblərə qəbul olunmaq istəyənləri tanış etməkdir”.

Məqamı ikən qeyd edək ki, “Açıq qapı” gününün iştirakçılarına ADPU-nun tarixi, fakültələri, buradakı ixtisaslar, həmçinin elmi-tədqiqat laboratoriyaları, universitetdə fəaliyyət göstərən professor-müəllimlərin, eləcə də bakalavriat və magistr pillələrində təhsil alan tələbələrin ümumi sayı, bakalavr səviyyəsi üzrə hansı ixtisaslar üzrə pedaqoji kadrlar hazırlandığının göstəricisi olan, olduqca nəfis şəkildə hazırlanmış ADPU-nun bukleti paylanmışdı.

Qonaqlar onlara paylanan bukletdən, eləcə də professor M.Cəbrayılovun əhatəli və dərin məzmunlu çıxışından öyrəndilər ki, ADPU 1921-ci ildə fəaliyyətə başlayıb. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 1991-ci il tarixli müvafiq qərarı ilə universitet statusu verilmişdir.

ADPU zəngin maddi-texniki bazaya, güclü elmi-pedaqoji kadr potensialına malikdir.

Universitetdə “Ulu öndər Heydər Əliyevin xatirə muzeyi”, “Heydər Əliyev məktəbinin lektoriyası”, “Gender Təhsili Araşdırma Mərkəzi”, “Müasir Təlim Texnologiyaları, Təlim və Resurs Mərkəzi”, “Kompyuter Mərkəzi” fəaliyyət göstərir. Universitetdə çoxsaylı kompyuter sinifləri, müasir linqafon kabinetləri, ixtisas laboratoriyaları, mətbəə, 750000-ə qədər kitab fondundan ibarət zəngin kitabxana və idman zalları tələbələrin istifadəsindədir.

Universitetdə AMEA-nın 2 müxbir üzvü, 58 elmlər doktoru, 63 professor, 275 doent, 371 fəlsəfə doktoru çalışır.

Universitetdə 9000-dən çox tələbə təhsil alır.

Universitetdə 11 fakültə - Tarix, Filologiya, Pedaqoji, Kimya, Biologiya, Fizika, Riyaziyyat və informatika, Coğrafiya və çağırışaqədər hazırlıq, Pedaqoqika və psixologiya, Mühəndis-pedaqoji və bədii qrafika həmçinin Əlavə təhsil fakültəsi fəaliyyət göstərir.

ADPU-da ali təhsilin bakalavr pilləsində 21, ali təhsilin magistr pilləsində 27 istiqamətdə 52 ixtisaslaşma üzrə kadr hazırlığı həyata keçirilir.

Bakalavr səviyyəsi üzrə pedaqoji kadr hazırlığı aparılan ixtisaslar:

I ixtisas qrupu üzrə Fizika, Riyaziyyat və informatika, Riyaziyyat, Texnologiya, İnformatika müəllimliyi; II ixtisas qrupu üzrə Tarix və coğrafiya, Coğrafiya müəllimliyi; III ixtisas qrupu üzrəAzərbaycan dili və ədəbiyyatı, Xarici dil ingilis dili və fransiz dili, eləcə də Tarix, İbtidai sinif müəllimliyi, Korreksiyaedici təlim, Məktəbəqədər təlim və tərbiyə, Təhsildə sosial-psixoloji xidmət, Musiqi, həmçinin Təsviri incəsənət müəllimliyi; IV ixtisas qrupu üzrə isə Biologiya, Kimya, Kimya və biologiya, Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi ixtisasları üzrə pedaqoji kadrlar hazırlanır.

Görüşdə iştirak edən buraxılış siniflərinin şagirdləri professor M.Cəbrayılovun çıxışından həmçinin onu da öyrəndilər ki, universitetdə tədris prosesi kredit sistemi əsasında aparılır.

Pedaqoji təcrübələr Bakı şəhərinin ən müasir tələbələrə cavab verən, yüksək kadr potensialı olan qabaqcıl orta ümumtəhsil məktəblərində keçirilir.

Respublikada informasiya texnologiyalarının köməyi ilə biliyin qiymətləndirilməsinə ali təhsil müəssisələri arasında ilk dəfə olaraq ADPU-da başlanılmışdır.

Tələbələrin biliklərinin obyektiv və şəffaf qiymətləndirilməsi üçün kollokvium və semestr imtahanları, həmçinin Buraxılış Yekun Dövlət Attestasiyası test üsulu ilə kompyuter vasitəsilə həyata keçirilir.

ADPU Qara Dəniz Hövzəsi Ölkələrinin Universitetləri Assosiasiyasının, Avropa Müəllim Hazırlayan Ali Məktəblər Assosiasiyasının (ETEN) üzvüdür.

Universitet Türkiyə Respublikasının Hacəttəpə Universiteti, Mehmet Akif Ərsoy Universiteti, Kazan Humanitar və Sosial Elmlər Universiteti, Tacikistan Respublikasının Abuabdullo Rudaki adına Kulyab Dövlət Pedaqoji Universiteti, Rumıniyanın Babeş Bolyai Universiteti, Rusiya Elmlər Akakdemiyasının Radiotexnika və Elektronika İnstitutu, Abay adına Qazaxıstan Milli Pedaqoji Universiteti, Türkiyə Respublikasının Muğla Sıtqı Koçma Universiteti, Türkiyə Respublikasının Balıkəsir Universiteti, Türkiyə Respublikasının Kastamonu Universiteti, Türkiyə Respublikasının Qafqaz Universiteti, Türkiyə Respublikasının Adnan Menders Universiteti, Türkiyə Respublikasının Firat Universiteti, Ukraynanın M.P.Draqomonov adına Milli Pedaqoji Universiteti, Rusiya Federasiyasının Dağıstan Pedaqoji Universiteti, Moldova Respublikasının İon Kreanga adına Dövlət Pedaqoji Universiteti, Özbəkistan Respublikasının Nizami adına Daşkənd Dövlət Pedaqoji Universiteti ilə əməkdaşlıq edir.

Universitetdə əcnəbi tələbələrin işi üzrə dekanlıq fəaliyyət göstərir və əcnəbi tələbələr müxtəlif ixtisaslar üzrə təhsil alırlar.



“Açıq qapı” günündə həmçinin universitet qəbul komissiyasının sədr müavini, professor İbrahim Bayramov, Fizika fakültəsinin dekanı, professor Mirzəli Murquzov, Riyaziyyat fakültəsinin dekanı, fizika-riyaziyyat elmləri doktoru Maqsud Nəcəfov, Pedaqogika və psixologiya fakültəsinin dekanı, pedaqoji elmlər doktoru, dosent Şəhla Əliyeva, Kimya fakültəsinin dekanı, dosent Vaqif Həsənov, Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin dekanı, dosent Mətanət Əsgərova və başqaları çıxış edərək dekanı olduqları fakültələr haqqında, eləcə də bu fakültələrin respublikada tanınan məzunları haqqında məktəblilərə geniş məlumat verdilər, məzunları sevdikləri ixtisaslar üzrə mütəxəssis olmağa çağırdılar.

Tədbirə yekun vuran professor M.Cəbrayılov dedi: “Sizin hansı ali məktəbdə təhsil almaq qərarınız biz hörmətlə yanaşırıq. Ancaq bir şeyə əminəm ki, bu görüş hələ uzun müddət sizlərin xatirəsində yaşayacaq. Əgər bu görüşdən sonra sizlərin ürəyində öz müəllimlərinizə, müəllim peşəsinə rəğbətiniz bir qədər də artarsa elə bilirəm ki, bugünkü görüşümüzlə biz nəyə isə nail ola bilmişik”.

**A.İSGƏNDƏROV**

# Alman faşizmi üzərində Qələbənin 69-cu ildönümünə həsr edilmiş xeyriyyə tədbiri

Bu il may ayının 9-da alman faşizmi üzərində Qələbənin 69-cu ildönümü tamam oldu. Qeyd edək ki, ötən əsrin ortalarında dünya ağalığı iddiasına düşən Hitler Almaniyası qısa müddət ərzində Avropanın bir çox ölkələrini zəbt etmiş, 1941-ci il iyunun 22-də isə qəflətən Sovet İttifaqına hücum etmişdir. Sövet ölkəsində yaşayan bütün xalqlar Vətənin müdafiəsinə qalxmış və faşizmə qarşı mübarizədə böyük igidlik göstərmişlər. Bu müharibə 1945-ci ilin mayın 9-da Sovet İttifaqının qələbəsi ilə başa çatmışdır. İkinci Dünya müharibəsi və onun tərkib hissəsi olan Böyük Vətən müharibəsi öz miqyasına görə bəşəriyyət tarixində ən böyük, ən dəhşətli müharibə idi. Alman faşizmi üzərində Qələbənin qazanıılmasında Azərbaycan xalqının da böyük payı var. Böyük Vətən müharibəsində xalqımızın Həzi Aslanov, Mehdi Hüseynzadə, Gəray Əsədov, Qafur Məmmədov, İsrafil Məmmədov, Hüseynbala Əliyev, Əhmədiyyə Cəbrayılov, Tərlan Əliyarbəyov, Hacıbaba Zeynalov, Heybət Heybətov kimi igid oğulları misilsiz qəhrəmanlıq və fədakarlıq göstərmişlər. Tank qoşunları general-mayoru Həzi Aslanov 2 dəfə Sovet İttifaqı Qəhrəmanı adına layiq görülmüşdür. Ümumilikdə isə Böyük Vətən müharibəsi illərində 121 nəfər Azərbaycan vətəndaşı Sovet İttifaqı Qəhrəmanı adına layiq görülmüşdür. Xalqımız bu müharibədə 300 mindən çox vətəndaşını itirmişdir. Onu da qeyd edək ki, Azərbaycan nefti və taxılı da faşizm üzərində qələbənin qazanılmasında mühüm rol oynamışdır. Qədirbilən xalqımız Böyük Vətən müharibəsində həlak olmuş soydaşlarımızın xatirəsinə, eləcə də onların ailə üzvlərinə, həmçinin həmin qanlı müharibə illərində arxa cəbhədə fədakarlıqla çalışmış soydaşlarımıza hörmət və ehtiramla yanaşır, onlara hər cür maddi-mənəvi dəstək göstərir. Azərbaycan Qızıl Aypara Cəmiyyətinin (AQAC) ADPU bölməsinin bu il may ayının 2-də alman faşizmi üzərində Qələbənin 69-cu ildönümü münasibətilə keçirdiyi xeyriyyə tədbiri də bu baxımdan təqdirəlayiqdir.






Məlumat üçün bildirək ki, AQAC-ın ADPU bölməsinin üzvləri başda bölmənin sədri, Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının müdiri, professor Jalə Qədimova olmaqla universitetin veteran müəllimlərinin evlərində olmuş, onlara maddi köməklik göstərmiş, müxtəlif hədiyyələr vermişlər. Belə ki, bölmə ADPU-nun veteran müəllimləri, Kimya fakültəsinin dosenti Əbdülməcid Rzayevi, Pedaqogika və psixologiya fakültəsinin dosenti Nuru Cavadovu, Fizika fakültəsinin dosenti Yavər Abbasovu, Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin professoru Şaxəli Həsənovu 9 May-Qələbə Günü münasibətilə təbrik etmiş, onlara maddi köməklik göstərmişdir.

AQAC-ın ADPU bölməsinin keçirdiyi bu xeyirxah tədbirdə bölmənin üzvlərindən Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının müəllimi İradə Qasımova, baş müəllimi Kəmalə İsmayılova, Kimya fakültəsinin dekan müavini, dosent Ədilə Mahmudova, bölmənin Pedaqogika və psixologiya fakültəsi üzrə sədri, baş müəllim Qəribə Rəhimova, Fizika fakültəsi üzrə sədri, dosent Xatirə Adıgözəlova, Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin dekanı, bölmənin fakültə üzrə sədri, dosent Mətanət Əsgərova, Biologiya fakültəsi üzrə sədri, baş müəllim İmran Kazımov fəal iştirak etmişlər.

Görüş zamanı AQAC-ın ADPU bölməsinin sədri, professor J.Qədimova ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun salamlarını universitetin veteran müəllimlərinə çatdırmış, onlarla səmimi söhbət etmiş, qayğı və istəkləri ilə maraqlanmışdır. Eyni zamanda professor J.Qədimova bu xeyriyyə tədbirində onlara verdiyi dəstəyə görə ADPU-nun rektoru, professor Yusif Məmmədova öz dərin təşəkkürünü bildirmişdir.

**Gülnar BƏXTİYARQIZI**

# Müstəqilliyimizin şərəfli səhifəsi

## ADPU-da 28 May - Respublika Gününə həsr edilmiş tədbir keçirilib

May ayının 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "Heydər Əliyev məktəbinin lektoriyası"nda 28 May - Respublika Gününə həsr edilmiş tədbir keçirilib. Tədbirdə ilk olaraq Azərbaycanın Dövlət Himni səsləndirilib. Tədbiri giriş sözü ilə açan ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov bildirib ki, bizim bugünkü toplantımız xalqımızın milli bayramı olan Respublika Gününə həsr edilib. 96 il bundan öncə xalqımız müsəlman Şərqində ilk dəfə demokratik respublikanı - Azərbaycan Xalq Cümhuriyyətini qurub. Lakin Azərbaycan Xalq Cümhuriyyəti əlverişsiz daxili və xarici vəziyyət üzündən yalnız 23 ay yaşaya bilib. Ancaq xalqımızın azadlıq və istiqlal arzusu heç zaman sönməyib. 1991-ci il oktyabr ayının 18-də xalqımız yenidən öz dövlət müstəqilliyini elan edib. Lakin 1991-1993-cü illərdə Azərbaycanın müstəqilliyi formal xarakter daşıyıb. Yalnız xalqımızın böyük oğlu, ümummilli liderimiz Heydər Əliyev Azərbaycanın formal müstəqilliyini faktiki, hüquqi müstəqilliyə çevirib. Ulu öndərimiz Heydər Əliyev müstəqil dövlətimizi qurub, gücləndirib, onu dünya miqyasında tanıdıb, nüfuzlu beynəlxalq təşkilatların, o cümlədən Birləşmiş Millətlər Təşkilatının (BMT) və Avropa Şurasının (AŞ) tamhüquqlu üzvü edib. Ulu öndər Heydər Əliyevin müdrik inkişaf strategiyasını uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin uzaqgörən və balanslaşdırılmış siyasi kursu nəticəsində ölkəmiz BMT Təhlükəsizlik Şurasının qeyri-daimi üzvü seçilib. İqtisadi cəhətdən dinamik inkişaf edən Azərbaycan mötəbər siyasi, iqtisadi və mədəni tədbirlərin keçirildiyi bir məkana çevrilib. Artıq Azərbaycanı bütün dünya tanıyır və onun beynəlxalq siyasi nüfuzu ilə hesablaşır. Bugünkü müstəqil, demokratik, hərtərəfli inkişaf edən Azərbaycan Respublikası Azərbaycan Xalq Cümhuriyyətinin siyasi-hüquqi varisidir və biz bundan qürur hissi duyuruq.

Tədbirdə Azərbaycan tarixi kafedrasının baş müəllimi, tarix üzrə fəlsəfə doktoru Elman Mirzəyev məruzə ilə çıxış etmişdir. Məruzəçi Elman Mirzəyev bildirmişdir ki, may ayının 28-də Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 96-cı ildönümü tamam olur. Ulu öndər Heydər Əliyev demişdir: "Azərbaycan Xalq Cümhuriyyəti az yaşasa da, xalqımızın azadlıq, müstəqillik fikirlərini daha gücləndirmiş oldu".

E.Mirzəyev öz məruzəsində qeyd etmişdir ki, XX əsrin əvvəllərində cərəyan edən ictimai-siyasi proseslər xalqımızın milli şüurunun oyanmasına güclü təkan vermişdir. Rusiyada çarizmin devrilməsi, baş verən fevral və oktyabr çevrilişləri, Birinci Dünya müharibəsinin nəticələri, ermənilərin zaman-zaman xalqımıza qarşı öz havadarlarının köməyi ilə törətdikləri deportasiya və soyqırımları və digər amillər Azərbaycanın müstəqil bir dövlət kimi yaşamasını həyatı bir zəruriyyət kimi qarşıya qoymuşdu. Bunu yaxşı anlayan xalqımızın vətənpərvər və millətsevər övladlarının təşəbbüsü, fəal iştirakı və rəhbərliyi ilə 1918-ci il may ayının 28-də Tbilisidə Azərbaycan Milli Şurası «İstiqlal Bəyannaməsi»ni qəbul etdi. 24 səslə qəbul edilən və 6 bənddən ibarət olan Bəyannamə Azərbaycan xalqının varlığını bütün dünyaya yaydı. Hüquqi və siyasi sənəd olan Bəyannamədə müstəqil Azərbaycan dövlətinin yarandığı göstərilmiş, onun hakimiyyətinin əhatə etdiyi ərazinin hüdudları müəyyənləşdirilmiş və dövlətin əsas prinsipləri öz əksini tapmışdır. «İstiqlal Bəyannaməsi»ndə demokratik dövlətin əsas atributları sayılan hakimiyyətin xalqa məxsus olması, vətəndaşların mülki və siyasi hüquqlarının təminatı, bütün xalqların və hər bir kəsin milli, dini və cinsi mənsubiyyətindən asılı olmayaraq, azad inkişafı üçün şəraitin yaradılması, həmçinin hakimiyyətin bölünməsi prinsipləri hüquqi cəhətdən təsbit edilmişdi. Mayın 30-da isə Azərbaycanın öz müstəqilliyini elan etməsi barədə dünyanın əsas siyasi mərkəzlərinə radioteleqrafla məlumat verildi.




23 aylıq hakimiyyəti dövründə Azərbaycan Xalq Cümhuriyyəti çox ağır və mürəkkəb bir tarixi-siyasi şəraitdə fəaliyyət göstərmişdir. Bəzi xarici dövlətlərin Azərbaycanın müstəqil dövlət kimi yaşamasına imkan verməmək istəməmələri, xüsusilə də erməni silahlı dəstələrinin Qarabağda və Zəngəzurda yaratdığı qarşıdurmalar, onların xalqımıza qarşı törətdikləri vəhşiliklər, həmçinin parlament daxilində hökm sürən hərc-mərclik Azərbaycan Xalq Cümhuriyyətinin normal fəaliyyət göstərməsinə ciddi mənfi təsir göstərirdi. Lakin buna baxmayaraq, Azərbaycan Xalq Cümhuriyyəti öz dövlətçilik atributlarını qəbul etmiş, dövlət və hərbi quruculuq, iqtisadiyyat və mədəniyyət, təhsil və səhiyyə sahələrində mühüm əhəmiyyət kəsb edən ciddi addımlar atmışdır. 1918-ci il iyunun 27-də Azərbaycan dilinin dövlət dili elan edilməsi haqqında fərman imzalandı, iyunun 24-də üzərində ağ rəngli aypara və səkkizguşəli ulduz təsviri olan qırmızı bayraq dövlət bayrağı kimi qəbul edildi, noyabrın 9-da isə həmin bayraq üçrəngli - yaşıl, qırmızı və mavi zolaqlardan ibarət olan bayraqla əvəz edildi. Sentyabrın 1-də Hərbiyyə Nazirliynin yaradılması barədə qərar qəbul edildi. 1919-cu ilə kimi Milli Ordunun yaradılması məqsədilə hökumət tərəfindən 400 milyon manat vəsait ayrılmışdı. Ordunun yaradılması prosesi 1920-ci ilin yanvarında əsasən başa çatdırıldı. Yaradılmış 40 min nəfərlik nizami ordunun 30 mini piyada, 10 mini isə süvari qoşun hissələrindən ibarət idi. Onu da qeyd edək ki, ölkəmizdə milli parlamentarizmin təşəkkül tarixi də Azərbaycan Xalq Cümhuriyyəti parlamentinin 1918-ci il dekabr ayının 7-də keçirilmiş ilk iclasından başlayır. Azərbaycan Xalq Cümhuriyyətinin parlamentinin 145 iclası keçirilmiş, 100-dən çox hüquqi sənəd qəbul edilmişdir.

Azərbaycan Xalq Cümhuriyyətinin liderləri yeni yaradılmış müstəqil dövlətimizin beynəlxalq aləmdə tanınması üçün ciddi diplomatik iş aparmışlar. Belə ki, 1920-ci il yanvarın 11-də Paris sülh konfransında Azərbaycanın dövlət müstəqilliyi de-fakto tanınmışdır. Azərbaycanın de-fakto tanımasına qədər xalqımız qısa bir müddət ərzində normal fəaliyyət göstərən dövlət aparatı yaradaraq 20-dən çox dövlətlə-Türkiyə, Gürcüstan, ABŞ, İngiltərə, Fransa, İtaliya, İsveçrə və digər dövlətlərlə baş konsulluq, konsul agentlikləri səviyyəsində əlaqələr qura bilmişdi. Yeni yaranmış dövlət «Türkləşmək, islamlaşmaq və müasirləşmək!» ideyası uğrunda mübarizə aparırdı.

Cümhuriyyət dövründə xalq maarifi sahəsində də bir sıra tədbirlər həyata keçirilmişdir. Orta məktəblərin təxminən yarısı milliləşdirilmiş, bütün məktəblərdə Azərbaycan dilinin tədrisi məcburi hesab olunmuşdur. 1919-cu il sentyabrın 1-də bugünkü Bakı Dövlət Universitetinin təsis olunması haqqında qərar verilmişdir. Kənd Təsərrüfatı İnstitutunun (indiki Azərbaycan Dövlət Aqrar Universitetinin) yaradılması haqqında qanun qəbul edilmişdir. Eyni zamanda Bakıda Ali Əkinçilik Məktəbinin yaradılması haqqında qərar qəbul edilmiş, Bakıda, Şəkidə, Gəncədə və Şuşada Müəllimlər Seminariyası açılmışdır. Bunlarla yanaşı, Salyanda, Qusarda, Zaqatalada müəllim hazırlayan kurslar təşkil edilmişdir.

Yuxarıda qeyd etdiyimiz kimi, Azərbaycanın beynəlxalq aləmdə tanımasına baxmayaraq, ölkənin şimal sərhədlərində vəziyyət gərgin idi. Belə ki, Sovet Rusiyasının Xarici işlər komissarı Ç.Çiçerin 1920-ci il yanvarın əvvəllərində Azərbaycan hökumətinə nota göndərərək Denikin əleyhinə hərbi ittifaq bağlamağı təklif etdi. Bu isə əslində gənc respublikanın Denikinlə qeyri-bərabər hərbi münaqişəyə cəlb edilməsi yolu ilə onun istiqlaliyyətinə son qoyulması demək idi. Bunu yaxşı anlayan Azərbaycan rəhbərliyi cavab notasında bildirdi ki, Denikinlə Sovet hökuməti arasında mübarizə rus xalqının daxili işidir və Azərbaycan hökuməti Rusiyanın bu daxili işinə qarışmaq niyyətində deyildir. Ç.Çiçerin isə yanvarın 23-də göndərdiyi ikinci notasında Azərbaycan hökumətini Denikinə qarşı mübarizə aparmaqdan boyun qaçırmaqda günahlandırırdı. Ümumiyyətlə, Sovet Rusiyası nəinki Azərbaycanın müstəqilliyinə münasibət bildirməkdən imtina edir, həm də ölkəmizə hərbi müdaxilə üçün siyasi-hərbi zəmin hazırlayırdı. Vəziyyəti gərginləşdirən başqa bir amil də bolşeviklərin Azərbaycan daxilindəki təxribatçılıq fəaliyyəti idi. Bu təxribatların başında isə Mikoyan dayanırdı. Bolşeviklər həm də Ermənistanın Azərbaycana qarşı olan düşmən münasibətindən istifadə edirdilər. Beləliklə, 1920-ci ilin aprelində Denikin qoşunlarını məğlub edən XI Ordu Azərbaycan sərhədlərinə yaxınlaşdı. Aprelin 15-də Fətəli xan Xoyski Çiçerinə nota göndərərək rus ordusunun Azərbaycan sərhədində toplanmasının səbəblərinə aydınlıq gətirməsini tələb etdi, lakin Çiçerin bu notaya heç bir əhəmiyyət vermədi. Mikoyan başda olmaqla bolşeviklər XI Ordunu Bakıya çağırdılar. Qabaqcadan razılaşdırılmış plana görə, Bakıda bolşevik qiyamı başlanmasından bir-iki gün sonra ordu Bakını işğal etməli idi. Bununla da dünya ictimaiyyətində belə bir fikir, rəy yaradılacaqdı ki, guya Azərbaycan hökuməti xarici hərbi müdaxilənin deyil, daxili qiyamın qurbanı olmuşdur. Lakin Bakıda qiyam başlamamış, yəni aprelin 26-dan 27-nə keçən gecə XI Ordu hissələri Azərbaycan ərazisinə daxil olub, Bakıya doğru irəliləməyə başladı. Bu zaman Azərbaycan Ordusunun demək olar ki, hamısı Qarabağda ermənilərə qarşı döyüşürdü, ölkənin şimal sərhədləri isə müdafiəsiz qalmışdı. Yalnız sərhəd qüvvələrindən ibarət azsaylı Azərbaycan Ordu hissələri isə düşmənə müqavimət göstərə bilmədi.



XI Ordunun ölkəmizə hücumu ilə eyni vaxtda aprelin 27-də gündüz saat 12-də AK(b)PMK və RK(b) P Qafqaz Diyar Komitəsinin Bakı Bürosu adından hakimiyyəti təhvil vermək haqqında parlamentə ultimatum ünvanlandı. Parlament həmin gün saat 20.45-də hakimiyyətin Azərbaycan kommunistlərinə verilməsi barədə qərar çıxardı.

Beləliklə, Azərbaycan tamailə işğal edildi, onun müstəqilliyi zorla əlindən alındı. Kirov, Orconikidce, Mikoyan xalqımızın milli istiqlalının qənimləri oldular. Azərbaycan Xalq Cümhuriyyəti liderlərinin bir qismini Məmməd Əmin Rəsulzadə kimi mühacir həyatı yaşamağa məcbur etdilər, digər bir qismini isə Fətəli xan Xoyski və Həsən bəy Ağayev kimi erməni terrorunun qurbanına çevirdilər, qalanlarını isə bolşevizmin amansız repressiyalarına məruz qoydular.

E.Mirzəyev çıxışına davam edərək bildirdi ki, biz bu gün Azərbaycan Xalq Cümhuriyyətinin yaranma tarixindən, onun liderlərinin çox çətin, mürəkkəb daxili və beynəlxalq siyasi şəraitdə xalqımızın milli maraqlarının təmin edilməsi istiqamətində həyata keçirdikləri fədakar vətənpərvər fəaliyyətlərindən danışarkən böyük qürur hissi keçiririk. Çünki Azərbaycan Xalq Cümhuriyyətinin milli dövlətçiliyimiz tarixində, ictimai-siyasi fikir tariximizdə xüsusi şərəfli yeri və böyük rolu var. Xalqımız Cümhuriyyət liderlərinin xatirəsini əziz tutur. Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 80 və 90 illik yubileyləri dövlət səviyyəsində qeyd edildi. Azərbaycan Prezidenti cənab İlham Əliyev 2013-cü il fevral ayının 25-də Azərbaycan Xalq Cümhuriyyəti parlamentinin sədri Əlimərdan bəy Topçubaşovun 150 illik yubileyinin, həmin ilin noyabr ayının 22-də isə Milli Şuranın sədri Məhəmməd Əmin Rəsulzadənin 130 illik yubileyinin keçirilməsi haqqında sərəncamlar imzalamışdır. Bu gün Azərbaycan Xalq Cümhuriyyətinin siyasi-hüquqi varisi olan güclü və nüfuzlu Azərbaycan Respublikası hər birimizin qürur mənbəyidir.

Tədbirdə Tarix fakültəsinin II kurs magistrantı Fəridə Fərşidova çıxış etmiş, Əməkdar müəllim, şair Oqtay Rza Azərbaycan Xalq Cümhuriyyətinə və şəhid tələbəmiz İlham Cəfərova həsr etdiyi şeirlərini oxumuşdur.

**Mənsur QÜDRƏTOĞLU**

# Tarix fakültəsində ingilis dilində növbəti Açıq dərs

Mayın ayının 13-də Tarix fakültəsinin I kursunun 101-ci və 104-cü qrup tələbələri ilə ingilis dilində növbəti Açıq dərs keçirilmişdir. Tədbirdə Tarix fakültəsinin dekanı, professor Oqtay Sultanov, dekan müavinləri, dosent Nazir Əsədov və baş müəllim Habil Həsənov, Xarici dillər kafedrasının müdiri, dosent Gülçöhrə Alıyeva, həmin kafedranın baş müəllimi Lyudmila Mehdiyeva, müəllimləri Arzu Hüseynova, Səadət Əliyeva, Günay Məmmədzadə, Türkan Əhmədova, Məmməd Rahim adına 7 nömrəli pilot məktəbin qabaqcıl müəllimi Nəzakət Qədirova iştirak edirdilər. Öncə Xarici dillər kafedrasının müdiri, dosent G.Alıyeva və kafedranın baş müəllimi Sevda Ağayeva Açıq dərsin iştirakçılarını salamlamış və uğurlar arzulamışdır. Xarici dillər kafedrasının baş müəllim Sevda Ağayevanın keçirdiyi Açıq dərs ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr olunmuşdu.

Tədbirdə ilk olaraq Azərbaycanın Dövlət Himni səsləndirildi. Sonra tələbə-gənclərə ulu öndər Heydər Əliyevin həyat və fəaliyyəti haqqında məlumatlar çatdırıldı. Bundan sonra tələbələr ingilis dilində Xalq şairimiz Səməd Vurğunun məşhur "Azərbaycan" şeirini söylədilər. Daha sonra tələbələr Azərbaycan haqqında, eləcə də Bakı, Gəncə, Naxçıvan, Şuşa, Şəki, Qəbələ, Quba, Şamaxı, Lənkəran, Yardımlı, Bərdə şəhərləri barədə geniş məlumat verdilər, həmin şəhərlərin tarixinə nəzər saldılar. Qeyd edim ki, hər bir şəhər haqqında məlumat verilməzdən əvvəl onlara aid mahnılar səsləndi, bütün bu məlumatlar videoçarx vasitəsilə nümayiş etdirildi.



Onu da qeyd edim ki, bütün bu məlumatları tələbələr Ülvi Şamilov, Vüsalə Vəlizadə, Aysel Şirinova, Könül Rüstəmova, Səidə Hüseynova, Leyla Eyvazova, Yusif Şahməmmədov, Zümrüd Quliyeva, Süsən Xəlilova, Kəmalə Kərimli, Qədir Babayev, Aysel Qəniyeva, Nuranə Hüseynova, Əfsanə Rzayeva, İradə Məmmədova, Samir Məmmədli, Vüsal Baratlı, Fərrux Əlizadə sinxron şəkildə videoçarxla auditoriyaya təqdim etdilər. Videoçarxı isə İradə Məmmədova və Fərrux Əlizadə təqdim etdilər.

Açıq dərsin sonunda III kurs tələbəsi Fərrux Əlizadə müəllim və tələbələrə təşəkkür etdi. O, belə açıq dərslərin artıq 3 il davam etdiyini bildirdi və söylədi ki, onların 3 il əvvəl keçirdikləri tədbirdən bu tədbir daha mükəmməl, daha maraqlıdır. Sonra isə Xarici dillər kafedrasının müdiri, dosent G.Alıyeva, həmin kafedranın baş müəllimi L.Mehdiyeva, müəllimləri A.Hüseynova, S.Əliyeva, G.Məmmədzadə, T.Əhmədova və M.Rahim adına 7 nömrəli pilot məktəbin müəllimi N.Qədirova çıxış edərək baş müəllim S.Ağayeva və tələbələrə öz təşəkkürlərini bildirdilər. Dosent G.Alıyeva tələbərin ingilis dilində sərbəst və səlis danışmalarını xüsusi qeyd etdi və bunu alqışladı.



Fransız dili müəllimi L.Mehdiyeva təklif etdi ki, bundan sonra belə tədbirlər iki dildə - ingilis və fransız dillərində keçirilsin. N.Qədirova söylədi ki, məktəbdə tez-tez belə tədbirlər keçirilir, amma bu tədbirin fərqli cəhəti ondan ibarətdir ki, tələbələr Azərbaycanın tarixi barədə ingilis dilində geniş və dolğun məlumat verdilər.

**Sevda AĞAYEVA,**
**Xarici dillər kafedrasının baş müəllimi**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Botanika kafedrasının müdiri, dosent Anaxanım Yusifovaya qardaşı

**Etibar müəllimin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi "Dədə Qorqud" elmi-tədqiqat laboratoriyasının böyük elmi işçisi, dosent Oqtay Rzaya əzizi

**Mənsurə xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fizikanın tədrisi metodikası kafedrasının baş müəllimi Ağaxəlil Əliyevə əzizi

**İqbalın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: A. Z. İSGƏNDƏROV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi-34, ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 2195
Sayı: 1500
Çapa imzalanıb: 31.05.2014-cü il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompyuter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.